# Mündəricat

# QURAN TƏHRİF OLUNMAYIB

## KİTAB HAQQINDA

ALLAHIN ADI İLƏ

MÜƏLLİF:ŞEYX MƏHƏMMƏDCAVAD FAZİL LƏNKƏRANİ

TƏRCÜMƏ EDƏN:MAQSUD SAYIL

Kitabın adı:........................Quran təhrif olunmayıb

Müəllif:...Şeyx Məhəmmədcavad Fazil Lənkərani

Tərcümə edən:....................................Maqsud Sayıl

Nəşr edən:...................................................Moce–elm

Çap növbəsi:.....................................................Birinci

Tiraj:............................................................................٣٠٠٠

٩٦٤-٩٥٨٤٢-٦-٩

səh:١

## ÖN SÖZ

Sonuncu Peyğəmbərin (s) əbədi möcüzəsini, əzəli və əbədi həqiqətlər dolu geniş süfrəni, yaradılışın ən böyük əmanətini, yəni Quranı (böyük bir məsuliyyət olaraq) öhdəsinə götürmək ləyaqətini verdiyi üçün uca Tanrıya minnətdaram. Həqiqətən, insan kəraməti, onun mütləq kəramət sahibi tərəfindən nazil olması ilə reallaşmışdır. Bu sonsuz ümman öz alçaq-hündür dalğalarında ən böyük hidayət sirlərini və ən doğru səadət yollarını gizləmişdir. Bu, daim bəşər yoluna işıq saçan hidayət çırağıdır. Bu, əbədi nur, bütün hallarda rəhbər və hər an zikrdir. Bu, elə bir kitabdır ki, Allah onun .əbədi qorunacağını vəd etmişdir və o, öz vədinə daim vəfadardır

( أَلَا إِنَّ وَعْدَ اللَّهِ حَقٌّ )

(Xəbəriniz olsun ki, Allahın vədi haqdır”.(١)“

Bu kiçik topluda diqqətinizə çatdırılanlar Quranın təhrif olunmadığı haqqında ən mühüm məqamlardır. Bu mövzu Quran elmlərində əsaslı məsələlərdən biridir. Təhrif mövzusunun əhatəli və ətraflı araşdırılması bu kitab üzərində araşdırmalar aparan tədqiqatçıların üzərinə düşür. Əslinə qalsa, təhrif nəzəriyyəsini islam məzhəblərinə aid etməkdə ifrata varılmışdır. Belə ki, etiqadlarının özülünü təhrif nəzəriyyəsinin inkarı təşkil edən bir məzhəbin təhrifə əqidə bəsləməsini söyləmişlər. Biz bu məsələnin müxtəlif cəhətlərini araşdırmaqla yanaşı sübuta yetirəcəyik ki, Şiə məzhəbi nəinki təhrif nəzəriyyəsini qəbul etmir, prinsipcə qəbul edə də bilməz. Çünki bu müddəa .qəbul edildiyi təqdirdə, Şiə əqidəsinin əsasları aradan gedəcəkdir

Gəlin, böyük elm adamlarının, görkəmli şəxsiyyətlərin iştirakı ilə keçirilən bu konfransda(٢) birgə bəyanat verək və bununla bütün dinlərə, məzhəblərə və millətlərə Quranın Peyğəmbər (s) dönəmindən bu günədək təhrif olunmadığını və qiyamətə .qədər də olunmayacağını elan edək

Biz bu məsələni, Quranin bu günə qədər təhrif olunmadığı şəklində qoymuruq. Əksinə, biz iddia edirik ki, bu müqəddəs kitabın təhrif olunmayacağı Allahın qəti iradəsidir. Belə ki, heç bir şəxs və ya qrup bu kitabı təhrif etmək iqtidarında deyil. Bu əbədi möcüzə əsrlər boyu ona düşmən kəsilmiş yağıları mübarizəyə çağıraraq özünü təhrifdən .qorumuşdur

Biz bu yazımızda təhriflə bağlı bütün məsələləri təfərrüatı ilə, geniş şəkildə araşdırmaq əzmində deyilik. Çünki bu tədqiq yalnız cildlərlə kitaba sığa bilər. Burada qarşıya qoyduğumuz məqsəd, təhrif məsələsini aydınlaşdırmaq üçün bir neçə mühüm .məqamı qısa şəkildə araşdırmaqdır



---

.Yunus, ۵۵ [۱]-۱

.Bu elmi əsər ilk dəfə böyük bir konfransa verilmək məqsədi ilə qələmə alınmışdır [۲]-۲

**BİRİNCİ MƏQAM**

TƏHRİF" TERMİNİNİN TƏDQİQİ"

Təhrif" termini ərəb dilində "təfil" modelinin məsdəri olub, etimoloji baxımdan "hərf"" sözü ilə əlaqədardır. "Hərf" sözü lüğətdə bu və ya digər əşyanın kənarı, ucu mənasını, təhrif sözü isə bu və ya digər əşyanın kənarlaşdırılması, tərəflərinin dəyişdirilməsi .mənalarını ifadə edir

:Allah-təala Quranda buyurur

وَمِنَ النَّاسِ مَن يَعْبُدُ اللَّهَ عَلَى حَرْفٍ)

(İnsanlardan eləsi də vardır ki, Allaha birtərəfli ibadət edirlər".(١"

Bu kimi şəxslər imanı zəif olan insanlardır. Belələri döyüş zamanı uzaqda dayanıb tamaşa edən insanlara bənzəyirlər. Hansı ki, qoşun qələbə çaldıqda yaxına gələr, (qənimət yığar, əks təqdirdə isə qaçaraq aradan çıxarlar.(٢

Bu termin hərfi məna etibarı ilə mütləq şəkildə dəyişdirilmək mənasını kəsb edir. Elə buna görə də təhrif termininin ilkin mənasının "Ləfzi təhrif" (sözdə təhrif, sözlərin dəyişdirilməsi yolu ilə baş verən təhrif) olduğunu iddia etmək heç də əsassız deyil. Lakin Quranda müxtəlif dəlillər olduğu üçün ikinci mənada – "Mənəvi təhrif" (mənada təhrif, mənanın dəyişdirilməsi yolu ilə baş verən təhrif) mənasında işlədilmişdir. Belə ki, :yəhudi alimlərini məzəmmət edərək buyurur

مِنَ الَّذِينَ هَادُواْ يُحَرِّفُونَ الْكَلِمَ عَن مَّوَاضِعِه)

Yəhudilərin bir qismi (Tövratdakı) sözlərin mənasını dəyişərək ilahi məqsədlərdən" (yayındırır və ilkin zahiri (ibtidai) mənalarına yozmurdular".(٣



---

.Həcc, ١١ [٣] -١

.Kəşşaf, c. ٢, səh. ١۴۶ [۴] -٢

.Nisa, ۴۶ [۵] -٣

ən məvazihi) qeydinin gətirilməsi təhrifdə məqsədin "mənəvi) "عَن مَّوَاضِعِهِ" Bu ayədə təhrif" olduğuna aydın sübutdur. Məhz elə buna görə də Rağib İsfahani "təhrifül-:kəlam" sözünü izah edərkən yazır

(Sözü təhrif etmək, onu ehtimal oluna biləcək iki mənadan birinə yozmaqdır".(١"

Təbii ki, Rağib İsfahani bu sözü təhrif termininin hərfi mənasını açıqlamaq məqsədi ilə deməmişdir. Əksinə, o, "təhrifül-kəlam" dedikdə Quranda buyurulan mənəvi təhrifi .(mənanın dəyişdirilməsi yolu ilə baş verən təhrifi) nəzərdə tutmuşdur

Fəxr Razi məlum ayəni şərh edərkən bir çox versiyaları qeyd etmiş və onların bəzisinin ləfzi təhriflə (sözlərin dəyişdirilməsi yolu ilə baş verən təhriflə) uyğun gəldiyini bildirmiş, lakin sonda nəticə alaraq düzgün versiyanin mənəvi təhrif olması fikri üzərində dayanmışdır. O yazır: "Təhrifdə məqsəd bid`ətçilər kimi yanlış ehtimallar verərək şübhə toxumu səpmək, sözü müxtəlif ləfzi hiylələrlə düzgün mənaya deyil, (tamamilə əks mənaya yozmaqdır.(٢

**İKİNCİ MƏQAM**

TƏHRİF SÖZÜNÜN İŞLƏK MƏNA VƏ NÖVLƏRİ

Ayətullah Xoyi kimi görkəmli tədqiqatçı alimlərin əsərlərində təhrif sözünün bir səs tərkibinə malik olmasına baxmayaraq, altı (bir-birinə yaxın) müxtəlif məna kəsb etdiyi iddia edilmişdir.(٣) Bu altı mənanın ifadə etdiyi altı növ təhrifin bir neçəsi müsəlmanların yekdil rəyinə görə Quranda olmuş, bir neçəsi həmin rəyə əsasən olmamış, bir neçəsinin olub-olmamasında isə fikir ayrılığı mövcuddur.(۴) Biz burada, öncə Mərhum Ayətullah Xoyinin təhrif termininin mənaları haqqındakı görüşlərini .olduğu kimi qeyd edəcək, sonra isə araşdıracağıq

səh:۴

---

.Müfrədat, səh. ١١٢ [۶] -١

.(Təfsire-kəbir, c. ١٠, səh. ١١٧ (Köhnə çap [٧] -٢

Dilimizdə bu növ sözlərə çoxmənalı sözlər deyilir. Çoxmənalı sözlərdə [ ٨] -٣ omonimlərdən fərqli olaraq, hər hansı bir sözün ifadə etdiyi mənalar əsasən, bir

məfhumun ətrafında toplanaraq onu müxtəlif məna çalarlıqları ilə ifadə edir.

۴- [۹] Əl-Bəyan, səh. ۲۱۵.

Birinci məna: Burada təhrif bir şeyin öz yerləşdiyi yerinin və aid olduğu mənasının dəyişdirilməsi mənasını ifadə edir. Aşağıda qeyd olunan ayə həmin mənanın bariz .nümunəsidir

مِنَ الَّذِينَ هَادُواْ يُحَرِّفُونَ الْكَلِمَ عَن مَّوَاضِعِهِ)

Yəhudilərin bir qismi (Tövratdakı) sözlərin mənasını dəyişərək ilahi məqsədlərdən" (yayındırır və ilkin zahiri (ibtidai) mənalarına yozmurdular".(١)

Təhrifin bu növü "mənəvi təhrif" (mənanın dəyişdirilməsi yolu ilə olunan təhrif), yaxud .da "şəxsi rəyə əsaslanan təfsir" ifadələri ilə yad edilir

Müsəlmanlar Quranın bu şəkildə təhrif olunmasında həmfikirdirlər. Çünki, Quranı olduğu kimi təfsir etməyənlər, həqiqi mənasından yayındıranlar, onu öz nəfsani meyllərinə və şəxsi fikirlərinə uyğun olaraq təhrif etmiş olurlar. Əhli-beytdən (ə) nəql olunan çoxsaylı rəvayətlərdə bu növ təhrif məzəmmət olunmuşdur. İmam Baqir (ə) :Sədul-Xeyrə ünvanladığı bir məktubda buyurur

وَ كانَ مِنْ نَبْذِهم الكِتاب أَنْ أقامُوا حُرُوفَه وَ حَرَّفُوا حُدُودَهُ ، فَهُمْ يَروونَهُ وَ لا يَرْعَوْنَهُ

İkinci məna: Burada təhrif, Quranın bir küll şəklində qorunması ilə yanaşı hər hansı bir hərfinin və ya əlamətinin azaldılıb, yaxud çoxaldılmasına deyilir. Quranda bu növ təhrifin də olması öz təsdiqini tapmışdır. Çünki, Qiraət elmi ilə əlaqədar yazılmış kitablarda sübut və qəbul edilmişdir ki, mövcud qiraətlərin(٢) heç biri "mütəvatir"(٣) deyil. Mütəvatir olmadığına görə də bu qiraətlərin yalnız biri həqiqi Quranla uyğundur. .Digər qiraətlər isə Quranda ya artıma, ya da əskilməyə səbəb olur

Üçüncü məna: Bu mənada da Quran bir küll şəklində qorunur. Amma buna .baxmayaraq, bir və ya bir neçə söz artırılıb, yaxud azaldılmış olur

Quranın, İslamin erkən çağlarında və səhabələrin zamanında bu şəkildə təhrif olunması inkarolunmazdır. Lakin bu növ təhrifə qarşı mübarizə aparılmış və qarşısı alınmışdır. Buna sübut müsəlmanların bu məsələdə həmfikir olmalarıdır. Tarixi

.Nisa, ۴۶ [۱۰] -۱

.Kafi, c. ۸, səh. ۵۳. Əl-Vafi, Səlat kitabının sonu [۱۱] -۲

Hədis” elmi terminologiyasında “mütavatir” o tipli hədisə deyilir ki, onu nəql edən“[۱۲] -۳ rəvayətçilər hədisin saxtalaşdirilması və ya quraşdırilması haqqında razılaşa .bilməyəcəkləri qədər çox olsun

dəlillərə görə, Osman Quranın müxtəlif fərqli nüsxələrini bir yerə toplayıb yandıraraq, öz məmurlarına belə bir tapşırıq verdi ki, Quranın onun nüsxəsindən fərqli olan bütün nüsxələri toplanıb yandırılmalıdır. Bütün bunlar göstərir ki, digər mövcud nüsxələrin Osmanın nüsxəsi ilə fərqləri olmuşdur (Bir çox alimlər, o cümlədən Əbu Davud Səcistani "Əl-Məsahif" əsərində bu fərqləri bir yerə toplamışdır). Nəticə etibarilə Osmanın vasitəsilə yandırılan nüsxələr təhrif olunmuşdur. Amma, onun bir yerə toplayaraq yaydığı nüsxə isə nəsildən-nəslə keçərək bu gün müsəlmanlara çatmış Qurandır. Elə buna görə də qəbul etməliyik ki, Osmandan öncəki nüsxələr təhrif olunmuş, Osmanın nüsxəsinə əsaslanan bugünkü Quran isə təhrif təhlükəsindən .amanda qalmışdır

Dördüncü məna: Bu mənada Qurana bir ayə artırılıb, yaxud azaldılıb, amma nazil .olunmuş Quran (bir küll şəklində) qorunur

Bismillahir-Rəhmanir-Rəhim) ayəsinin Qurana) ) ( بِسْمِ اللَّهِ الرَّحْمَنِ الرَّحِيم Bu mənada yalnız artırılması və Peyğəmbərin (s) bu ayəni hər surənin əvvəlində oxuduğu musəlmanlar tərəfindən yekdilliklə qəbul edilir. Bundan başqa Quranın heç bir hissəsi bu şəkildə təhrif olunmamışdır. Bu məsələdə Əhli-sünnə alimləri arasında fikir ayrılığı mövcuddur. Belə ki, bəziləri onu Quranın bir hissəsi kimi qəbul edir, bəziləri isə bu şəkildə qəbul etmirlər. Lakin şiə alimləri sözügedən ayənin mütləq Qurandan və "Tövbə" surəsini .çıxmaq şərtilə hər bir surənin ayrılmaz hissəsi olduğunu qəbul edirlər

Beşinci məna: Qurana əlavələr olunması vasitəsi ilə olunan təhrif. Bu mənada bugünkü mövcud Quran Peyğəmbərə (s) nazil olunan əsl Quran deyil. Ümumiyyətlə, islamda iki cərəyan Quranın bu şəkildə, yəni ona əlavələr olunaraq təhrif olunduğunun :tərəfdarıdır. Bu iki cərəyan aşağıdakılardır

Əcaridə: Xəvaric cərəyanının öndərlərindən hesab olunan Əbdülkərim ibn Əcaridin .١ ardıcıllarına verilən ad. Bu cərəyanın tərəfdarları "Yusif" surəsinin Qurandan .olmadığını iddia edirlər

İbn Məsuda aid edilən fikir. O, Quranın son iki surəsinin Qurandan olmadığını iddia .٢ .edirmiş

Yuxarıda qeyd olunan iki cərəyanı çıxmaq şərtilə qalan bütün müsəlmanlar bu fikrin .yanlışlığı və Quranın bu şəkildə təhrif olunmadığı fikrindədirlər

Altıncı məna: Qurandan çıxarışlar vasitəsilə olunan təhrif. Bu mənada Peyğəmbərə (s) nazil olunan bəzi ayələr bugünkü mövcud Quranda yoxdur. Quranın bu şəkildə təhrif .olunub, yaxud olunmaması böyük fikir ayrılığına səbəb olmuşdur

Yuxarıda qeyd olunanların nəticəsi olaraq demək lazımdır ki, təhrifin sözügedən altı .mənasının ilk dördünün Quranda heç bir şəkildə baş vermədiyi məlumdur

Beşinci məna da yekdil rəyə görə baş verməmiş, altıncı mənada isə fikir ayrılığı .mövcuddur

Fikrimizcə, görkəmli tədqiqatçı alim mərhum Ayətullah Xoyinin bu açıqlamasında iki :irad özünü tam aydınlığı ilə göstərməkdədir. Bu iradlara nəzər salaq

Birinci irad: Tədqiqin tələbinə görə, qeyd olunan mənalar təhrif sözünün ifadə etdiyi mənalar deyil. Təhrifin yalnız bir mənası mövcuddur. Yəni birinci mənada qeyd olunduğu kimi, təhrif bu və ya digər əşyanın öz yerləşdiyi yerinin və ya aid olduğu mənasının dəyişdirilməsi mənasını ifadə edir. Sözügedən digər mənalar isə sadəcə olaraq, bu mənanın nümunələridir. Başqa sözlə desək, qeyd olunan bütün mənalarda nəyinsə yerləşdiyi yerinin, yaxud da aid olduğu mənasının dəyişdirilməsi anlayışı müxtəlif çalarlarla öz əksini tapmışdır. Lakin, bu dəyişiklik ya mənalarda baş verir, hansı ki, ona "mənəvi təhrif" deyilir, ya da sözdə baş verir. İkinci qisim özü də ya "təfsili" şəkildə (ətraflı, əhatəli bilik şəklində), ya da "icmali" şəkildə (ümumi bilik şəklində) olur. Başqa sözlə desək, hər hansı bir söz və ya ayə müəyyən şəkildə, ya da ümumi olaraq artırılır, yaxud azaldılır (yəni artırılıb-azaldıldığı məlumdur, amma konkret olaraq, hansı ayə və ya surədə olduğu məlum deyil). Deməli, görkəmli alim və tədqiqatçı Ayətullah Xoyinin açıqlamalarında qeyd olunanlar təhrif sözünün bir .çoxmənalı söz kimi aid olduğu mənalar deyil, sadəcə olaraq, nümunələridir

İkinci irad: Bu bölgü təhrifin bütün qisimlərinin yanlış olması zərurətini meydana çıxarır. Əks təqdirdə, məlum bölgüyə daxil olarlarsa, bu ayənin (١)( لَا يَأْتِيهِ الْبَاطِلُ مِن بَيْنِ يَدَيْهِ ) aidiyyatından xaric olarlar. Çünki ayənin ilkin mənası Quranda heç bir yanlışlığın olmadığını göstərir. Məhz elə buna görə də təhrifin müsəlmanların yekdil rəyinə əsasən Quranda baş verdiyini iddia etdiyi qismini inkar etməlidir. Əlbəttə, bunun .mənəvi təhrifdə mümkün olmadığı nəzərə çarpır

Təhrif termininin müxtəlif mənalarını aydınlaşdırdıqdan sonra onun növlərinə nəzər :salaq

.Mütəxəssislərin rəyincə təhrifin altı növü mövcuddur

Ləfzdə (sözdə) təhrif: Bu növ təhrifdə məqsəd sözlərin artırılıb-azaldılması, yerlərinin .١

.dəyişdirilməsidir

Mənada təhrif: Bu növ təhrifdə məqsəd mənanı heç bir aidiyyatı olmayan yanlış .۲ mənaya yozmaqdır. Təhrifin bu növünə “şəxsi rəyə əsaslanan təfsir” də deyilir. Hansı ki, rəvayətlərdə kəskin şəkildə məzəmmət olunmuşdur. Peyğəmbər (s) bu barədə buyurur: “Quranı öz şəxsi rəyinə əsaslanaraq təfsir edən kimsə, özünə oddan yer (hazırlamışdır”.(۲



---

.(Nə öncə, nə də sonra batil ona yol tapa bilməz...(Fussilət, ۴۲ [۱۳] -۱

.Əvali əl-ləali, c. ۴, səh. ۱۰۴ [۱۴] -۲

Yerdəyişmə yolu ilə olunan təhrif: Bu növ təhrifdə məqsəd, bu və ya digər ayənin, .٣ yaxud surənin nazil olduğu ardıcıllığa əks şəkildə qeyd olunmasıdır. Təhrifin bu növü nadir hallarda baş vermişdir. Belə ki, bütün ayələr nazil olunduğu ardıcıllıqla qeydə alınmışdır. Surələrə gəldikdə isə, onların hamısının Peyğəmbərin (s) göstərişi ilə həmin .ardıcıllığa əks şəkildə qeydə alındığını iddia etmək olar

Qiraətdə (oxunuşda) təhrif: Bu növ təhrifdə məqsəd, Quranın bu və ya digər sözünü .۴ müsəlmanların yekdilliklə qəbul etdikləri qiraətə uyğun olmayan şəkildə oxumaqdır. .Bir çox qarilərin qiraət zamanı etdikləri dəyişiklikləri buna misal göstərmək olar

Ləhcədə təhrif: Müxtəlif qəbilələr arasındakı ləhcə fərqləri ayələri öz ləhcələrinə .۵ .uyğun şəkildə oxumalarına səbəb olur

Ayrı-ayrı sözlərin digər sinonimləri ilə, yaxud başqa sözlərlə əvəz olunması yolu ilə .۶ olunan təhrif: Artıq məlum olduğu kimi təhrifin bu növündə məqsəd, bu və ya digər sözün başqa sözlə əvəz olunmasıdır. İstər bu sözlər sinonim olsun, istərsə də sinonim olmasın. İbn Məsud bu növ təhrifi sinonimlərdə düzgün hesab edir. Onun rəyinə görə, .Həkim) ifadəsi ilə dəyişmək olar) "حكيم" Əlim) ifadəsini ) "عليم" Quranda

**ÜÇÜNCÜ MƏQAM**

İCMALİ" VƏ "TƏFSİLİ" TƏHRİF"

.Öncə qeyd etdiyimiz kimi, təhrif (digər bir bölgüyə görə) "icmali", yaxud da "təfsili"dir

Burada bizim mübahisə obyektimizə daxil olacaq qisim "Təfsili" təhrifdir. Başqa sözlə desək, biz burada Quranda baş vermiş konkret artım və ya azalma haqqında söhbət açacağıq. Lakin "İcmali" təhrif, yəni Quaranda ümumi şəkildə artim, yaxud azalma baş verməsi (belə ki, təhrif baş verdiyini bilir, lakin bunun konkret olaraq hansı ayə və ya surədə olduğunu bilmirik) bizim mübahisə obyektimizdən xaricdir. Misal üçün Bismillahir-Rəhmanir-Rəhim)) ( بِسْـــمِ اللَّهِ الرَّحْمَـــنِ الرَّحِيـــمِ ),qiraətlərdə mövcud fərqləri ayəsinin Qurandan olub-olmamasını və s. göstərmək olar. Çünki bizim söhbət açdığımız təhrif istər azaldılma yolu ilə olsun, istərsə də çoxaldılma yolu ilə, hər iki halda Allahın sözü ilə müvafiq deyil. Amma qiraətlər isə fərqli olmalarına

بِسْمِ اللَّهِ الرَّحْمَنِ الرَّحِيمِ .baxmayaraq, birinin Allah kəlamı ilə müvafiq olmasına şübhə yoxdur Bismillahir-Rəhmanir-Rəhim) ayəsinə gəldikdə isə, şübhəsiz ki, Peyğəmbər (s) onu) ) ( hər surənin əvvəlində oxumuşdur. Fikir ayrılığı yalnız onun xırdalıqlarındadır. Xırdalığa varanlar əsl Quranın məhz belə olduğu qənaətindədirlər, xırdalığa varmayanlar isə, əsl Quranın bu ayəsiz olduğu fikri üzərində dayanırlar. Nəticə etibarilə bu iki düşüncənin daşıyıcılarının heç biri öz versiyalarının əsl Qurana zidd olduğunu (yəni əsl Qurana əlavə nə isə artırılıb, yaxud azaldılmasını) güman etmirlər. Belə ki, hər iki versiyanın tərəfdarları Qurana ilahi vəhydən başqa bəşər sözünün daxil olmadığını .yekdilliklə qəbul edirlər. Qiraətlərin fərqliliyi də bu qəbildəndir

Demək, "icmali" təhrifin nümunələri hər hansı bir şəxsin həqiqi sözü, yaxud qiraəti olmadığına baxmayaraq, bizim mübahisə obyektimiz xaricindədir. Bizim mübahisə .obyektimiz olan təhrif əsl Qurana nəyinsə artırılması və yaxud da azaldılmasıdır

## DÖRDÜNCÜ MƏQAM

XƏBƏRİ-VAHİD"İN(۱) TƏHRİFİN SÜBUTU ÜÇÜN YETƏRSİZLİYİ"

Bu və ya digər ayənin Qurandan olduğunu iddia etmək üçün kəskin elmi dəlilə ehtiyac var. Hər hansı bir ayənin Qurandan olduğunun isbatı üçün "Xəbəri-vahid"in yetərli olmadığı kimi, təhrifin isbatı üçün də yetərli deyil. Təhrif nəzəriyyəsini dəstəkləyənlər öz müddəalarının isbatı üşün kəskin, yetərli elmi dəlillər göstərməlidirlər. Başqa sözlə desək, etiqadla bağlı məsələlərin isbatı üçün "xəbəri-vahid" və bu kimi sırf gümana əsaslanan dəlilləri yetərli bilmədiyimiz kimi, ən mühüm dəlil olan Quranı da heç bir şəkildə "xəbəri-vahid"lə qəbul edib, yaxud etməmək olmaz. Məhz elə buna əsaslanan :Şeyx Tusi "Tibyan" adlı təfsir kitabının müqəddiməsində yazır

Quranın təhrifini iddia edən rəvayətlər bütünlüklə "xəbəri-vahid"dirlər. "Xəbəri-vahid" " ."tam elmi dəlil olmadığı üçün təhrif məsələsində də yetərli sayılmır

Şeyx Tusinin məqsədi, bu məsələnin tam yəqin edilməsi şərt olan məsələlərdən .olmasıdır

Hədis” elmi terminologiyasında sənəd silsiləsində mövcud olan rəvayətçiləri“ [۱۵] -۱
.mütəvatir həddinə yetməyən hədisə “xəbəri-vahid” deyilir

## BEŞİNCİ MƏQAM

### BÖYÜK ŞİƏ ALİMLƏRİNİN QURANIN TƏHRİF OLUNMASI BARƏSİNDƏ FİKİRLƏRİ

Böyük şiə alimləri Quranın təhrif olunmadığı qənaətindədirlər. Belə ki, onlar hazırkı Quranın heç bir artım və ya azalma baş vermədən Peyğəmbərə (s) nazil olunan Quran .olduğunu qəbul edirlər

Burada şiə məzhəbinin dayaqları və qələmə aldıqları əsərlər bu məzhəbin əqidəsi hesab olunan bir neçə alimin görüşlərini qısa şəkildə diqqətinizə çatdıracağıq. Lakin .öncə iki məsələyə diqqət yetirməyi zəruri hesab edirik

Bir çox Quran elmləri ilə bağlı kitablarda Quranın təhrif olunması nəzəriyyəsini Əhli-.١ sünnənin "Həşviyyə" qoluna aid etdikləri kimi, Şiə məzhəbinin də "Əxbari" qoluna aid etdikləri nəzərə çarpır. Nəzərə almaq lazımdır ki, "Vəsailüş-Şiə" kitabının müəllifi, Şeyx Hürr Amili kimi bir çox əxbari alimlər Quranın təhrif olunmadığı fikrində olmuş, hətta bu haqda elmi əsər belə yazmışlar. Deməli, əxbari olmaq heç də Quranın təhrif olunması .qənaətində olmaq deyil

Şübhəsiz ki, şiə alimləri Qurana nəyinsə artırılması yolu ilə təhrif olunmaması.٢ haqqında yekdil rəyə malikdirlər. Lakin azaldılma yolu ilə təhrif olunmaması barəsində isə Müqəddəs Bağdadi(١) (Vafiyə kitabının izahinda), görkəmli şiə mərcəi-təqlidi Şeyx Cəfər Kaşiful-ğita (Kaşiful-ğita əsərində) kimi dahilər eyni yekdil rəyin olduğunu iddia etmişlər. Elə buna görə də böyük şiə alimlərinin əsərlərində Quranın mütləq şəkildə, istər artırma, istərsə də azaltma yolu ilə təhrif olunmaması barəsində yekdil rəyin .mövcudluğunun iddia olunduğunu iddia etmək olar

:İndi isə görkəmli şiə alimlərinin görüşlərinə nəzər salaq

Hicrətin üçüncü əsrində böyük şiə tədqiqatçılarından olmuş Fəzl ibn Şazan "İzah".١ əsərində Quran ayələrinin azaldılma yolu ilə təhrif olunduğunu inkar edərək, təhrif barəsində mövcud olan rəvayətlərin nəql olunmasının digər firqələrə aid olduğunu .bildirmişdir

Hicrətin dördüncü əsrində şiə aləminin elmi simalarından olan, Şeyx Səduq kimi.٢ tanınan İbn Cəfər Məhəmməd ibn Əli ibn Babəveyh Qumi "Etiqadlar" adlı elmi əsərində :yazır

:Bizim Quran haqqında əqidəmiz belədir"

Hazırkı Quran eynilə Peyğəmbərə (s) nazil olan Qurandır. Ona heç bir şey artırılmamışdır. Kimsə bizi hazırkı Quranın azaldılmasına əqidə bəsləməkdə ittiham ."etsə, yalançıdır

Dahi şiə fəqihi Seyid Mürtəza Ələmül-huda kimi tanınan Əli ibn Hüseyn Musəvi.٣ :"Tərablosiyyat" məsələlərinin cavabında yazır

Quranın təhrif olunmadığını bilmək, şəhərləri tanımaq, məşhur tarixi olayların" həqiqətəuyğunluğunu bilmək kimi bir şeydir. Onların həqiqətəuyğunluğunu tam əminliklə bildiyimiz kimi, Quranın təhrif olunmadığına da qəti şəkildə əminik. Çünki müsəlmanlar Quranın qorunmasına daim hədsiz səy göstərmişlər. Quran Peyğəmbər (s) dönəmində tam şəkildə tənzimlənmişdir. Belə ki, o həzrət Quranın qorunması üçün Übəy ibn K`əb və digər bir neçə nəfərdən ibarət heyət yaratdı və Quranı dəfələrlə tam ."şəkildə onlar üçün oxudu

:Seyid Mürtəza sözünə davam edərək yazir

Şiələrdən və ya Əhli-sünnənin "Hışviyyə" qolundan bu fikirlə razılaşmayıb ona qarşı" çıxanlarla razılaşmaq olmaz. Çünki onların dəlil kimi göstərdikləri, bir neçə səhih ((düzgün) hesab etdikləri zəif rəvayətdir.(١

:Şeyxut-taifə Əbu Cəfər Məhəmməd ibn Həsən Tusi bu haqda yazır.٤

Quran kimi dəyərli bir kitabın azaldılıb-çoxaldılmasından söhbət etmək bu kitaba" hörmətsizlikdir. Çünki ona bir şeyin artırılmadığı haqda yekdil rəy mövcuddur. Bir şeyin azaldılmasını da müsəlman məzhəbləri qəbul etmirlər. Bu, ilk növbədə şiə alimlərinin fikirləri və səhih (düzgün) rəvayətlərin məzmunu ilə üst-üstə düşür. Qurandan bir neçə ayənin çıxarıldığını göstərən şiə və əhli-sünnə rəvayətləri "xəbəri-vahid" olduğu üçün (onlara əsaslanıb əmin ola bilmərik. Buna görə də onlara əsaslanmaq düzgün deyil".(٢

Böyük təfsirçı alim “Məcməul-bəyan” əsərinin müəllifi Əbu Əli Fəzl ibn Həsən Təbərsi.۵ :öz təfsirinin müqəddiməsində yazır

Qurana bu və ya digər ayənin artırılması şiələrin yekdil rəyinə görə düzgün deyil. Hər“ hansı bir ayənin azaldılmasını isə şiələrin bir neçəsi və Əhli-sünnənin “Həşviyyə” qolu .nəql etmişdir. Lakin şiələr bunun əksini qəbul edirlər

:Seyid ibn Tavus yazır.۶



---

.Məcməul-bəyan, c. ۱, səh. ۱۵ [۱۷] -۱

.Tibyan kitabının giriş sözü [۱۸] -۲

(Şiə məzhəbi Quranın təhrif olunmadığı qənaətindədir".(١"

:Digər bir yerdə yazır

Hazırkı Quranın Peyğəmbərə (s) nazil olunan Quran olduğuna, o həzrətin Quranı bir" yerə toplamasına inandıqları bir halda, mədinəlilərlə məkkəlilərin, kufəlilərlə Bismillahir-) ( بِسْــــمِ اللَّهِ الرَّحْمَــــنِ الرَّحِيــــمِ )" ,bəsrəlilərin fikir ayrılıqlarından danışanlara Rəhmanir-Rəhim) ayəsi Quranın bir hissəsidir, amma surədən deyil" - deyə fikirləşənlərə təəccüb edirəm. Təəccüblüdür ki, əqlin və şəriətin təsdiq etdiyi kimi (Quran mütləq şəkildə təhrif olunmayıbsa, belə bir fikri necə irəli sürürlər".(٢

:Molla Möhsün Feyz Kaşani yazır.٧

Təhrifi təsdiqləyən hədislər Allahın kitabı ilə ziddiyyət təşkil edir. Bu kimi hədislər ya" (rədd edilərək kənara qoyulmalı, ya da yozulmalıdır".(٣

:Şeyx Tusi kimi tanınan Məhəmməd Bəhauddin Amuli Quran haqqında yazır.٨

Vəsailüş-şiə" kimi mühüm bir hədis kitabının müəllifi Şeyx Məhəmməd ibn Həsən".٩ Hürr Amuli Quranın təhrif olunmadığını sübuta yetirmək məqsədi ilə qələmə aldığı elmi :əsərdə yazır

Tarixi və məsum imamlardan (ə) nəql olunan rəvayətləri dəqiq araşdıran hər bir şəxs " Quranın minlərlə səhabə tərəfindən təsdiqləndiyinə və Peyğəmbər (s) dönəmində tam (şəkildə toplanaraq tərtib edildiyinə əmin olar".(٤

Nadir şiə fəqihlərindən olan Şeyx Cəfər Kaşifül-ğita dəyərli "Kaşifül-ğita" əsərində .١٠ :yazır

Müsəlmanların yekdil rəyinə, din və məzhəb prinsiplərinə görə, Qurana bir şey əlavə" edilməmiş, Quranın öz buyuruğuna və bütün alimlərin yekdil rəyinə görə, ondan heç bir şey çıxarılmamışdır. Bu məsələdə qarşı tərəfin nadir versiyasına əsaslanmaq (olmaz".(٥

Bütün bunlar böyük şiə alimlərinin görüşlərindən nümunələrdir. Onlardan yadigar qalmış yazılı əsərlərdən aydın görünür ki, Quranın təhrif olunması versiyası yanlış

versiyadır. Belə ki, bu versiyanın yanlışlığı özlüyündə aydın olan, təkzibedilməz müddəadır. Bir neçə nəfərin öz kitabında zəif rəvayətlərə yer verməsi bütöv bir məzhəbin əqidəsini təmsil edə bilməz. Belə olan halda, təhrif nəzəriyyəsini şiə alimlərinə necə aid etmək olar? Bu ittiham haramlığı aydın olan iftira deyilmi? Öz etiqadını, həmişəyaşar fikirlərini Qurandan alan bir topluma bu kimi iftiranı necə ?yaxmaq olar



---

.Sədus-süud, səh. ۱۴۴ [۱۹] -۱

.Həmin qaynaq, səh. ۱۹۳ [۲۰] -۲

.Təfsire-Safi, c. ۱, səh.۱۵ [۲۱] -۳

.İzharul-həqq, c. ۲, səh. ۱۲۹ [۲۳] -۴

.Kaşiful-ğita, səh. ۲۹۹ [۲۴] -۵

## ALTINCI MƏQAM

QURAN VƏ DİGƏR SƏMAVİ KİTABLARIN FƏRQİ

Qarşılaşdığımız mühüm məsələlərdən biri Quran və digər səmavi kitabların fərqi məsələsidir. Nə üçün Quranın təhrif olunmadığını iddia edirik? Bir halda ki, digər səmavi kitabların təhrif olunması sübuta yetmiş müddəalardandır. Belə ki, bir çoxları bunu Quranın da təhrif olunduğuna sübut kimi göstərirlər. Çünki bir tərəfdən Qurandan öncəki səmavi kitabların təhrif olunması təkzibedilməzdir, digər tərəfdən isə şiə və əhli-sünnənin qəbul etdiyi "mütəvatir" hədisdə deyilir: "Keçmiş ümmətlərin başına gələnlər bu ümmətin də başına gəlməlidir".(١)

Deməli, Quranın da təhrif olunması qaçılmazdır.

Bu kimi rəvayətlərin tədqiqi və cavabı təhrif nəzəriyyəsini qəbul edənlərin iradlarına cavab verərkən verilməlidir.(٢) Burada aydınlıq gətirmək istədiyimiz məsələ Quranla digər səmavi kitabların fərqidir. Bir çoxları deyirlər: Keçmiş kitablarda baş vermiş təhrif "Mənəvi təhrif" və ya şəxsi fikirlərlə olunan təfsir şəklində olmuşdur. Quran keçmiş ümmətlərin kitablarında bu növ təhrifin baş verdiyini təsdiqləyir, lakin azaldılıb çoxaldılması haqqında bir söz demir.(٣) Bundan başqa, rəvayətlərdə, alimlərin əsərlərində məlum kitabların azaldılıb-çoxaldılmasını təsdiq edəcək hər hansı bir dəlil yoxdur. Quran Tövrat, İncil və nazil olunmuş digər kitabların dövrün alimləri tərəfindən qorunub saxlanılmadığını vurğulayaraq buyurur:

(وَلَوْ أَنَّهُمْ أَقَامُواْ التَّوْرَاةَ وَالإِنجِيلَ وَمَا أُنزِلَ إِلَيهِم مِّن رَّبِّهِمْ لأكَلُواْ مِن فَوْقِهِمْ وَمِن تَحْتِ أَرْجُلِهِم)

"Əgər onlar Tövrata, İncilə və Rəbləri tərəfindən onlara nazil edilənə (ilahi kitabların sonuncusu olan Qur'ana) düzgün əməl etsəydilər, həm (başları) üstündə, həm də ayaqları altında olanlardan (göylərin və yerin nemətlərindən) qidalanardılar".(٤)



---

١- [٢٥] Biharul-ənvar, "İftiraqul-ümməti bədən-Nəbi" babı, c. ٨, səh. ٤.

٢- [٢٦] Bax: Əl-Bəyan, səh. ٢٢١.

٣- [٢٧] Siyanətul-Quran ənit-təhrif, səh. ٩٤.

Əsas məsələ, bu dəyərli kitabın əbədi və həmişəyaşar bir möcüzə olaraq təqdim olunmasıdır. Elə buna görə də daim təhrif olunmadan, heç bir qatqısız qalması zəruridir. Digər kitablar isə Qurandan fərqli olaraq, əbədi bir möcüzə kimi təqdim .olunmamışlar

## YEDDİNCİ MƏQAM

### QURANIN MƏQAM VƏ MƏRHƏLƏLƏRİ

Böyük əhəmiyyətə malik olan məsələlərdən biri də mübahisə obyektinin hansı Qurana aid olduğu, başqa sözlə desək, Quranın mövcud məqam və mərhələlərindən hansına aid olmasıdır. Quranın özünün də buyurdğu kimi, bu müqəddəs kitabın məqam və .mərhələləri var

Birinci mərhələ: "Lövhi-məhfuz". Təbii ki, bu mərhələdə təhrif ola bilməz. Çünki bu, bəşərin qüdrəti xaricindədir. Quran bu mərhələdə Allah dərgahında hər bir təhlükədən .amandadır

İkinci mərhələ: Quranın Cəbrayıl vasitəsilə Peyğəmbərə (s) nazil olunduğu mərhələ. Bu .mərhələdə də təhrif ola bilməz. Buna sübut Cəbrayılın bir mələk kimi məsum olmasıdır

Üçüncü mərhələ: Quranın Peyğəmbər (s) vasitəsilə insanlara təqdim olunması. Bu mərhələdə həzrət Peyğəmbər (s) Cəbrayılın onun qəlbinə nazil etdiklərini heç bir azaltma və ya çoxaltma olmadan insanlar üçün açıqlamışdır. Təbii ki, Quran bu mərhələdə də təhrif olunmamış, Peyğəmbərin (s) öz dönəmində tam bir kitab şəklində toplanaraq tərtib olunmuş, çox sayda insan onu əzbərləmiş və zaman keçdikcə .mütəvatir şəkildə gələcək nəsillərə ötürülmüşdür

Dördüncü mərhələ: Bu mərhələdə məqsəd, mütəvatir Quranı təmsil edən Quranların mövcudluğudur. Başqa sözlə desək, yazılı, istər əlyazma, istərsə də çap olunaraq nazil olunmuş həqiqi Quranı təmsil edən Quranların mövcudluğudur. Təbii ki, bu mərhələdə təhrif, qiraətlərin fərqlilik mənasında mümkündür. Eləcə də Quranın bu mərhələdə azaltma və ya çoxaltma yolu ilə təhrif olunması ehtimal oluna bilər. Bizim mübahisə obyektimizə daxil olan Quran bütün zamanlarda

mütəvatir şəkildə nəql olunaraq mövcud olmuş və olacaq vahid həqiqət, Allahın nazil Sözsüz ki, Biz onu (hər cür təhrifdən; artırıb-“ ) وَإِنَّا لَـــهُ لَحَـــافِظُونَ ( .etdiyi kəlamdır əvəzliyi Qurana ”ە“ əskiltmədən) qoruyub saxlayacağıq!”(١) ayəsində özünə yer alan aiddir və o, bir Quran, vahid həqiqətdir. Digər yazılı Quranlar isə onu təmsil edir. .Şübhəsiz ki, Quranın ayrı-ayrı çaplarında təhrif baş verə bilər

Yuxarıda qeyd etdiklərimizdən aydın olur ki, bir çox mühəddislərin: “Qorumaqda məqsəd, Allahın öz kitabını nazil etməzdən öncə qoruduğu kimi, nazil etdikdən sonra da qoruyacağıdır və burada Quranın səhifələr üzərində qorunması nəzərdə tutulmur”(٢)- deyə irəli sürdükləri fikir heç bir dəlili olmayan yanlış müddəadır. Quranın ecazkarlığı bu müddəaya qarşıdır. Çünki Quranın heç bir təhrif olunma qabiliyyətinə .malik olmayan belə bir yazılı mərhələdə qalması möcüzə olması fikrini inkar edir

## SƏKKİZİNCİ MƏQAM

QURANIN TƏHRİFİNİN ƏQLİ BAXIMDAN MÜMKÜNLÜYÜ, LAKİN TƏHRİF OLUNMAMASI

qoruma) ayəsindən məlum olur ki, Quran əqli baxımdan təhrif olunma) ”حـفـظ“ qabiliyyətinə malikdir. Lakin Allah-təala onu bu təhlükədən qoruyur. Əgər onun təhrif olunması əqli baxımdan mümkün olmasaydı, Allah-təalanın onu qorumasına ehtiyac yox idi. Allah-təala bu sırf əqli mümkünlüyü heç bir zaman dönməyəcəyi qəti vədəsi ilə .qeyri-mümkün etmişdir

## DOQQUZUNCU MƏQAM

TƏHRİFİ İNKAR ETMƏK ÜÇÜN QURANA ƏSASLANDIQDA “ƏBƏS DAİRƏ” ?(DÖVREDİCİLİK) YARANMIRMI



---

.Hicr, ٩ [٢٩] -١

.Fəslül-xitab, səh. ٣۶٠ [٣٠] -٢

Bir çox tədqiqatçılar Quranın təhrif olunmadığını sübut etmək üçün Quranın özünə əsaslanırlar. Burada aydınlaşdırmaq istədiyimiz məsələ, təhrif müddəasının yanlışlığını .sübut etmək üçün Qurana əsaslandıqda "əbəs dairə" yaranıb-yaranmamasıdır

Bir çoxları belə bir şəraitdə "əbəs dairə" yarandığı qənaətindədirlər və bu qənaətlərini .aşağıdakı şəkildə əsaslandırırlar

Birincisi, Quranın təhrif olunmamasının sübutu, onun ayələrinin bizim üçün etibarlı dəlil ola bilməsindən asılıdır. Bir halda ki, bu ayələrin etibarlılığı özü də Quranın təhrif olunmamasının sübutundan asılıdır. Deməli, Quranın təhrif olunmamasinin sübutu .təhrif olunmamasının sübutundan asılıdır

İkincisi, bu müddəanın sübutu üçün əsaslandığımız ayələrin bizim üçün etibarlı dəlil ola bilməsi Quranın təhrif olunmamasının sübutuna bağlıdır. Bir halda ki, Quranın təhrif olunmamasının sübutu da həmin ayələrin etibarlı dəlil ola bilməsinə bağlıdır. Nəticə etibarilə, məlum ayələrin etibarlı dəlil olması, həmin ayələrin etibarlı dəlil olmasından .asılıdır və bu "səbəbiyyət" qanununda "əbəs dairə", "dövredicilik"dir

.Bu irada fərqli cavablar verilmişdir. İndi isə həmin cavabları diqqətinizə çatdırırıq

:Birinci cavab: Mərhum Ayətullah Xoyi "əl-Bəyan" əsərində belə cavab verir

Məsum imamların (ə) ilahi xəlifələr olduqlarına əqidə bəsləməyənlər bu irada cavab" verə bilməzlər. Lakin onların ilahi xəlifələr, Quranın şərhçiləri olduqlarını qəbul edənlər üçün, artıq bu problem öz həllini tapmış olur. Çünki onlar özləri mövcud Qurana əsaslanmış, səhabələrinin Qurana əsaslanmalarını da təsdiqedici rəftarla qarşılamışlar. Deməli, mövcud Quran təhrif olunmuş olsa belə, imamların (ə) ona .əsaslandıqlarına görə bizim də əsaslanmağımız üçün yetərlidir

.Bu cavab, özündə əks etdirdiyi iki yanlışlığa görə tutarlı sayıla bilməz

Birincisi, bu cavab, yalnız məsum imamların (ə) vilayətini qəbul edənlər üçün faydalı ola bilər. Bu kimi irada bütün məzhəblər üçün faydalı ola biləcək cavab vermək .zəruridir

İkincisi, bu cavab əslində iradın özünü qəbul etmək deməkdir. Çünki bu fikrə əsasən, artıq Quranın təhrif olunmadığını sübut etmək üçün bilavasitə həmin ayələrə əsaslanmırıq. Əksinə, bu ayələrə məsumların (ə) təsdiqi ilə əsaslanırıq və bu, bizim müddəamıza ziddir. Bundan başqa, “Səqəleyn” hədisi də bu fikri qəti şəkildə rədd edir. .Çünki sözügedən hədisdə Quran özlüyündə müstəqil dəlil kimi təqdim olunmuşdur

İkinci cavab: Quranın təhrif olunduğunu iddia edənlər bunu olduqca məhdud şəkildə, yalnız bəzi rəvayətlərdə qeyd olunan ayələrə aid edirlər və təhrifi inkar edən ayələrin təhrif olunmadığını onlar da qəbul edirlər. Başqa sözlə, təhrif müddəası ilə çıxış .edənlər özləri belə bu ayələrin təhrif olunmadığı qənaətindədirlər

:Bu cavab da tutarlı deyil. Çünki təhrif haqqında iki nöqteyi-nəzər mövcuddur

Bir çoxlarının fikrincə, Quranın bir neçə müəyyən ayəsi təhrif olunmuşdur. Yuxarıda.١ .qeyd olunan cavab bu nöqteyi-nəzərə nisbətdə düzgündür

Bəzilərinə görə isə rəvayətləri nəzərə almasaq belə Quranın təhrif olunması "icmali".٢ şəkildə (ümumi bilik şəklində) məlumdur və bu təhrifi inkar edən ayələrə də aiddir. Bu .nöqteyi-nəzərə əsasən, yuxarıdakı cavab doğru deyil

Üçüncü cavab: Bir çoxları bu irada cavab olaraq belə bir fikir irəli sürmüşlər ki, bu (ayələrin təhrf olunmadığı haqda yekdil rəy mövcuddur.(١

Bu cavab da tam olaraq yetərli deyil. Çünki təhrif müddəasını qəbul edənlər Quranın "icmali" şəkildə təhrif olunduğu qənaətindədirlərsə, bu ayələri "icmali bilik"lər dairəsindən xaric edə bilməzlər. Başqa sözlə, həmin yekdil rəyi dəstəkləyə bilməzlər, .əks təqdirdə irəli sürdükləri fikrə qarşı çıxmış olacaqlar

Dördüncü cavab: Görkəmli tədqiqatçı fəqih Ayətullah Fazil Lənkərani bu problemin :həlli yolunu belə izah edir

Təhrif müddəasını rədd etmək məqsədi ilə bu ayələrə əsaslanmağın kimə - hansı fikir" .sahiblərinə qarşı olduğuna diqqət yetirmək lazımdır

Bu, yalnız rəvayətlərdə qeyd olunan bir neçə ayənin təhrif olunduğunu iddia edənlərə qarşıdırsa, "əbəs dairə" yaranması problemi mövzudan xaricdir. Çünki bu ayələr .rəvayətlərin təhrif olunduğunu göstərən ayələrdən deyil

Lakin təhrifin "icmali" şəkildə olduğunu iddia edənlərə qarşıdırsa, burada iki fərziyyə :mümkündür

Burada Quranın təhrif olunduğu qənaətində olan kimsə onun ilkin zahiri (ibtidai).١

mənasını təhrif olunmasına baxmayaraq etibarlı hesab edir. Burada “əbəs dairə”dən söhbət gedə bilməz. Çünki ayələrin ilkin zahiri (ibtidai) mənası öz etibarını əldən verməmiş və bu fərziyyəyə görə, təhrif onun etibardan düşməsinə səbəb olmamışdır. .Nəticə etibarilə məlum ayələrə əsaslanmaq mübahisəyə səbəb olmayacaqdır



---

.Ukzubətu təhrifil-Quran, səh. ۴ [۳۱] -۱

Burada təhrif müddəasını qəbul edən kimsə təhrifin Quranın ilkin zahiri (ibtidai).٢ mənasını, etibardan saldığı qənaətindədir. Bu fərziyyədə təhrif müddəasını qəbul edən, onu "icmali" şəkildə bildiyini iddia edir, yaxud da heç bir bilikdən söhbət açmır və bunun sırf ehtimal olduğunu bildirir. Birinci halda, hətta öz etibarını əldən verməsə belə məlum ayələrə əsaslanmaq olmaz. Çünki Üsul elmində sübuta yetirilmişdir ki, insana yalnız güman bəxş edə bilən ilkin zahiri (ibtidai) məna, elm ona qarşı çıxmadıqda faydalı ola bilər. Deməli, belə bir şəraitdə məlum ayələrə əsaslanmaq olmaz. İkinci halda isə heç bir elmi dayağı olmayan sırf ehtimal, (ayələri) etibardan sala bilməz və (həmin ayələrə əsaslanmaq mübahisəyə səbəb olmaz".(١)

.Bu cavabda da təhrif "icmali" şəkildə olarsa, bu ayələrə əsaslanmaq olmaz

Beşinci cavab: Fikirimizcə, təhrif də digər məsələlər kimi hər hansı bir məqsədə xidmət edir. Təbii ki, təhrifin məqsədləri hədsiz çox olduğu üçün, bu ayələr təhrif olunduğu ,surətdə, artıq təhrifə aid olmayacağı dərəcədə nöqsanlı hala salınmalı idi. Məsələn hissəsi çıxarılmalı, yaxud ən azı ayənin ) وَإِنَّا لَهُ لَحَافِظُونَ ( qoruma) ayəsində ayənin) "حفظ" sözü götürülməli idi. Deməli, "لَـهُ" təhrifi inkar etməsinə aidiyyatına çox təsirli olan Quranda ayələrin bu şəkildə mövcudluğu, təhrif olunmamasına insanı əmin edə biləcək aydın dəlildir. Təhrifi "icmali" şəkildə bildikdə belə, onun əksini göstərən "icmali" .şəkildə bilmədiyimiz bu ayələri "icmali" bilik hüdudlarından xaric edir

**ONUNCU MƏQAM**

TƏHRİF HAQQINDA İKİ İDDİA

:Öncəki açıqlamalardan aydın oldu ki, təhrif haqqInda iki növ iddia mövcuddur

Bir çoxlarının fikrincə təhrif yalnız rəvayətlərdə göstərilən müəyyən ayələrə.١ məxsusdur. Buna görə də Quranın digər ayələri təhrif təhlükəsindən amanda qalmış .və onların ilkin zahiri (ibtidai) mənasına əsaslanmaq mümkündür

Bu fikirdə olanların dəlil olaraq göstərdikləri, bəzi hədis kitablarında qeyd olunan .rəvayətlərdir

Bəzilərinə görə, Quran "icmali" şəkildə təhrif olunmuşdur. Başqa sözlə, Quranın təhrif.٢

(sürənlər, təhrif məsələsində “etibar” və s. bu kimi dəlillərə əsaslanmışlar.(۱)

## ON BİRİNCİ MƏQAM

### TƏHRİF MÜDDƏASINI İNKAR EDƏN ƏQLİ VƏ “ÜQƏLAYİ” DƏLİLLƏRİN TƏDQİQİ

Mütəxəssislrin əsərlərindən məlum olur ki, onlar təhrifi inkar etmək məqsədi ilə həm .əqli (rasional) dəlillərə, həm də aqillərin metoduna əsaslanmışlar

:Əqli (rasional) dəlillər

Bu dəlilləri açıqlamaq üçün iki yol mövcuddur. Birinci yol Ayətullah Xoyinin şərhlərində “qeyri-müstəqil” əqli (rasional) dəlillərlə qeyd olunmuşdur. Burada onu :ixtisarlaşdırılmış şəkildə diqqətinizə çatdırırıq

Təhrif ehtimalı üç haldan xaric deyil. Belə ki, əqli baxımdan onun üçün dördüncü hal .təsəvvür etmək mümkün deyil

Birinci hal: Təhrifin, Osmanın xilafətindən öncə Əbu Bəkr və Ömər vasitəsilə olunması .ehtimalı. Bu, qəti olaraq yanlış fikirdir. Çünki üç ehtimaldan xaric deyil

Birinci ehtimal: Təhrifin bilməyərəkdən baş verməsi ehtimalı. Yəni həzrət Peyğəmbərin (s) vəfatından sonra bu iki şəxs Quranın toplanmasını öhdəsinə götürmüş, məlumatsızlıq, Quranın hamısının onlara çatdırılmaması və ya diqqətsizlikdən bəzi .ayələri toplaya bilməmişlər və nəticədə Quran təhrif olunmuşdur

İkinci ehtimal: Təhrifin yuxarıda adları çəkilən iki şəxs tərəfindən bilərəkdən həyata keçirilməsi ehtimalı. Bu, onların xilafətinə və rəhbərliklərinə zərbə vurmayan ayələrdə .olmuşdur

Üçüncü ehtimal: Təhrifin bilərəkdən olması ehtimalı, lakin bu, ikinci ehtimaldan fərqli olaraq yuxarıda adları çəkilən iki şəxsin hakimiyyəti üçün təhlükəli olan



---

.Ətraflı məlumat üçün bax: Mədxəlut-təfsir, səh. ۲۹۲ [۳۳] -۱

ayələrdə olmuşdur. Hansı ki, təhrif nəzəriyyəsini qəbul edənlər bu ehtimalın üzərində .dayanırlar

:Qeyd olunan bütün ehtimallar yanlışdır. Birinci ehtimal iki səbəbə görə yanlışdır

Şübhəsiz ki, Peyğəmbər (s) Quranın əzbərlənməsini, qiraət və tərtilini əmr edirdi və.١ səhabələr bu məsələlərə böyük əhəmiyyət verirdilər. Buna görə də əminik ki, Quran tam olaraq hafizələrdə, yaxud da kağız üzərində sözügedən şəxslərə çatdırılmışdır. Quranın nazil olduğu dönəmdə ərəblər cahiliyyət şerlərini əzbərləməyə böyük əhəmiyyət verirdilər. Belə olan halda necə ola bilər ki, Qurana lazımi əhəmiyyət .verməsinlər

Səqəleyn" hədisi bu ehtimalın yanlışlığını üzə çıxarır. Çünki bu rəvayət Peyğəmbərin ".٢ (s), öz dövründə insanlara Qurana tapınmaqlarını əmr etdiyini göstərir. Təbii ki, bir neçə ayənin dəyişikliyə uğradığı halda, Qurana bir küll halında, tərtib olunmuş kitab .kimi tapınmaq mümkün deyildi

:İkinci ehtimalın yanlışlığı

Təbii ki, təhrifin bilərəkdən olunması üçün hər hansı bir səbəb lazımdır. Əbu Bəkr və Ömərin haikmiyyəti üçün zərərli olmayan ayələr haqqında belə bir səbəb olmamışdır. .Elə buna görə də bu ehtimal yanlışdır

Üçüncü ehtimalın yanlışlığı: Əgər belə bir vəziyyət yaransaydı, o halda Əbu Bəkr və Omər hakimiyyətinin ilk müxalifləri, onların önündə gedən Əli (ə), həzrət Zəhra (ə), mühacir və ənsardan olan on iki nəfər bu məsələyə öz etirazlarını bildirər və onu həmin hakimiyyətin nöqsanları sırasında qeyd edərdilər. Halbuki, velə bir iddia onların .heç biri tərəfindən qaldırılmamışdır

İkinci hal: Təhrifin, Osmanın xilafəti dövründə baş verməsi. Bu fikir birinci halda qeyd :olunan fikirdən daha zəif nəzəriyyədir. Çünki

Birincisi, İslam Osmanın xilafət dönəmində elə yayılıb möhkəmlənmışdı ki, Osman belə .bir iş görmək iqtidarında deyildi

İkincisi, əgər Osmanın xilafət dönəmində təhrif Əhli-beytin (ə) vilayəti ilə bağlı olmayan ayələrdə olubsa, buna heç bir səbəb olmayıb. Təbii ki, Quranda Əhli-beytin (ə) vilayəti ilə bağlı ayələrin təhrif olunmadığına əminik. Çünki Quranda tam aydınlığı ilə Əlinin (ə) xilafətini göstərən ayə olsaydı, xalq arasında yayılar və artıq xilafət Osmana .çatmazdı

Üçüncüsü, Əgər Osman Quranı təhrif etsəydi, ona qarşı çıxanlar üçün öz üsyanlarına bəraət qazandırmağa görə bundan yaxşı bəhanə yox idi. Bir halda ki, bu haqda ona .qarşı heç bir irad bildirilməmişdir

Dördüncüsü, əgər Quran Osman tərəfindən təhrif olunmuş olsaydı, Əli (ə) hakimiyyətə gəldikdən sonra Peyğəmbər (s) dövründə mövcud olan əsl Quranı meydana çıxarardı. .Bir halda ki, belə bir vəziyyət yaranmamışdır

.Deməli, ikinci hal da qəbulolunmazdır

Üçüncü hal: Təhrifin Osmanın xilafətindən sonra Bəni-üməyyə rejimi tərəfindən həyata keçirilməsi. Bu yozum da bu günə qədər heç bir alimin iddia etmədiyi .məsələlərdəndir

Əqli baxımdan dördüncü hal olmadığı üçün belə nəticəyə gəlirik ki, təhrif müddəası əqli və tarixi baxımdan heç bir dəlili olmayan yanlış iddiadır. Nəzərə almaq lazımdır ki, bu dəlil sırf müstəqil əqli qərar (hökm) deyil, əksinə, əqlin tarixi təhlildən çıxardığı .nəticədir

:İkinci yol: Burada öncə iki müqəddiməyə ehtiyac vardır

Birinci müqəddimə: İslam dini səmavi dinlərin sonuncusu olaraq, ən kamil din kimi qiyamət gününə qədər böyük bir zamanı əhatə edən bütün dövrlər üçün hamıya bəxş .edilmişdir

İkinci müqəddimə: Belə bir din, onun göstərişlərinin bir-biri ilə sıx əlaqədə olduğunu, .möhkəmliyini göstərən əbədi, həmişəyaşar bir sənədə malik olmalıdır

Bu iki müqəddiməni tərkib etdikdə (əlaqələndirdikdə) belə bir nəticə aliriq ki, Allah mütləq bu kitabı təhrif təhlükəsindən qorumalıdır. Bu, əqli baxımdan yaradanın üzərinə .düşən vəzifədir

Bu əqli (rasional) dəlil tutarlı deyil. Çünki ağıl nəticə çıxarır ki, Quran qiyamətə qədər olan bir zaman ərzində insanları hidayət etməyi öhdəsinə götürmüşdürsə, təhrif olunmamalıdır. Bu, mübahisə obyekti üçün yetərli deyil. Mübahisə obyektinə daxil olan məsələ Quranın təhrif olunub-olunmamasıdır. Ağıl isə müstəqil şəkildə bu məsələyə .dəxalət edə bilməz

Aqillərin metoduna gəldikdə isə, bir çox alimlər Quranın təhrif olunmadığını sübuta

:yetirmək üçün yazırlar

Hər bir yazıçının sözünü təhrif etmək qeyri-təbii hadisədir. Çünki aqil insanların“ metodu təhrifə etinasızlıq göstərməkdir. Buna görə də Quranın təhrif olunmaması .(təbii hadisədir”(۱

Bu dəlil, təhrif olunması üçün hər hansı bir səbəb olmayan kitaba aiddir. Lakin Quran .kimi, düşmənlərin səyi daim onu təhrif etmək olan bir kitaba aid deyil



---

.Təhrifin inkarının asan izahı, səh. ۱۲ [۳۴] -۱

## ON İKİNCİ MƏQAM

TƏHRİFİ İNKAR EDƏN ƏN AYDIN AYƏ

:Bir çox tədqiqatçıların iddiasına gorə, Quranın təhrifini inkar edən ən aydın ayə budur

( حَكِيمٍ حَمِيدٍ لَا يَأْتِيهِ الْبَاطِلُ مِن بَيْنِ يَدَيْهِ وَلَا مِنْ خَلْفِهِ تَنزِيلٌ مِّنْ وَإِنَّهُ لَكِتَابٌ عَزِيزٌ )

O (Qur'an), şübhəsiz ki, məğlubedilməz kitabdır. Nə öncə, nə də sonra batil ona yol" (tapa bilməz. O, hikmət sahibi, şükrə (tə'rifə) layiq olan tərəfindən nazil edilmişdir". (١

Hətta bəzilərinə görə, bu ayənin Quranın təhrif olunmadığını sübut edən ən aydın ayə (olduğunu təfsirçilər yekdilliklə qəbul edirlər. (٢

:Təhrifin inkarı üçün bu ayəyə bir neçə şəkildə əsaslanmaq mümkündür

,əziz) sözü ilə vəsf etmışdır. Məlum olduğu kimi) "عزيز" Allah-təala bu ayədə Quranı.١ əziz) sözü hərfi məna etibarilə hər hansı bir dəyişikliyə uğramadan, əskilmədən) "عزيز" (amanda olan əşya haqqında işlənilir. (٣

Bu ayədə "batil"in Qurana daxil olması inkar edilmişdir. İnkar ədatı bu kimi.٢ cümlələrdə ümumi məna ifadə edir. Yəni ayədə "batil"in bütün növ və qisimləri inkar edilir. "Batil" sözü hərfi məna etibarilə boş, faydasız, pozuq və s. mənalarını ifadə edir. .Məlumdur ki, təhrif "batil"in bariz nümunələrindəndir

Bu ayədə Allah-təala məlum hökmün səbəbi kimi Quranın tərifəlayiq, hikmət sahibi.٣ bir varlıq tərəfindən göndərildiyini göstərir və ona görə də "batil"in ona yol tapmayacağını bildirir. Bu səbəb özü hikmət sahibi olan varlıq tərəfindən göndərilən .kitabın təhrifolunmazlığını göstərir



---

.Fussilət, ٤١-٤٢ [٣٥] -١

.Siyanətul-Quran ənit-təhrif, səh. ٣٣ [٣٦] -٢

.Əl-Bəyan, səh. ٢١١ [٣٧] -٣

:Mərhum Hacı Nuri(۱) yazır

Quranın təhrifinin “batil”in nümunələrindən olmasına baxmayaraq, bu ayədə “batil”də“ məqsəd onun məhdud mənasıdır. Məqsəd əhkamda mövcud ola biləcək ziddiyyətlər, verilən xəbərlərdə hər hansı bir əksliyin meydana çıxması, biri digərini təkzib etmə və .s.-dir

:Mərhum Nuriyə cavab olaraq yazırlar

Hər hansı bir konkret ziddiyyətdən, əkslikdən söhbət etmək Quranı “izzət” sözü ilə“ vəsf etməklə uyğun gəlmir. Başqa sözlə desək, ayədə mövcud olan vəsf Quranın (“batil”in bütün növlərindən uzaq olmasını tələb edir”.(۲)

Fikrimizcə, bu cavab açıqlanmalı və təkmilləşdirilməlidir. Qeyd etməliyik ki, ayənin ilkin məğlubedilməz) olduğunu göstərir.) ”عزيز“ zahiri (ibtidai) mənası Quranın mütləq şəkildə Mütləq izzət sözü isə hər hansı bir məhdud ziddiyyətin, əksliyin nəzərdə tutulmasını tələb edir. Çünki kitab məhdud ziddiyyətlərdən qorunursa, bu zaman “izzət” sözünün .mənası da məhdudlaşır

Bu ayəyə əsaslanmağın başlıca iradı böyük şiə və əhli-sünnə alimlərinin təfsirləri ilə uyğun gəlməməsidir. Başqa sözlə, heç bir təfsirçı alim bu ayəni təhrifi inkar edəcəyi şəkildə açıqlamamışdır. Məsələn, Şeyx Tusi “Tibyan” kitabında məlum ayəni təfsir :edərkən beş ehtimal mövcud olduğunu vurğulayaraq yazır

Batil”in Qurana yol tapa bilməməsində məqsəd, ona heç bir şübhə aid edilməməsi“.۱ .və ziddiyyətlərin ona yol tapa bilməməsidir. Bir sözlə Quran xalis haqdır

Qutadə və Suddiyə görə, Allahın bu sözdə məqsədi budur ki, Şeytan Quranda hər.۲ .hansı bir haqqı azalda və ona batil əlavə edə bilməz

.Məqsəd Qurandan öncə və yaxud sonra onu batil edə biləcək bir şeyin olmamasıdır.۳

.Həsənə görə, məqsəd batilin onun əvvəlinə, yaxud axırına yol tapa bilməməsidir.۴

Quranın keçmişdən, yaxud gələcəkdən verdiyi xəbərlərdə hər hansı bir batil, yanlışlıq .۵ .yoxdur

:Seyid Mürtəza yazır

Bu ayənin ən gözəl açıqlaması budur ki, Qurana oxşar kəlam, söz yoxdur. O, özündən“ sonrakı hər hansı bir kitaba bənzəmir. Özündən öncəki kitablarla əlaqəli



---

.Fəslül-xitab, səh. ۳۶۱ [۳۸] -۱

.Əl-Bəyan, səh. ۲۱۱ [۳۹] -۲

deyil. Özündən sonrakı kitablar da ona bağlı deyil. Yəni Quran tam müstəqil, analoqu .olmayan, onunla müqayisə olunacaq hər hansı bir kitabdan üstündür

:Yuxarıda qeyd olunan ehtimallara belə cavab vermək olar

Birincisi, bu təfsir və açıqlamaların bəzisi təhriflə üst-üstə düşür. Buna misal olaraq, .Qütadə və Suddinin fikirlərini göstərmək olar

İkincisi, heç bir təfsirçi alim məlum ayənin təhriflə bağlı olduğunu bildirməsə belə, lazımi yerlərdə sübuta yetirilmişdir ki, təfsir metodlarından biri ilkin zahiri (ibtidai) .mənaya əsaslanmaqdır. Məlum ayənin ilkin zahiri (ibtidai) mənası təhrifə aiddir

Üçüncüsü, məlum ayədə yer alan "batil" anlayışını izah edən rəvayətlərdə hər hansı bir inhisar, məhdudiyyət nəzərə çarpmır. Bu açıqlamalar sadəcə olaraq bir neçə .nümunədir

## ON ÜÇÜNCÜ MƏQAM

TƏHRİF MÜDDƏASI QƏBUL OLUNDUĞU TƏQDİRDƏ, QURANIN İLKİN ZAHİRİ ?(İBTİDAİ) MƏNASI ETİBARDAN DÜŞÜRMÜ

Təhrif müddəasının qəbul olunduğu təqdirdə Quranın ilkin zahiri (ibtidai) mənası etibardan düşürmü və ya belə olan halda ona əsaslanmaq düzgündürmü? Bu sual yalnız Quranın təhrif olunduğunu iddia edən hər hansı bir şəxsin təhrifi "icmali" şəkildə .(ümumi bilik şəklində) bildiyi halda düzgündür

Bir çoxlarının fikrincə, hər hansı bir ayənin təhrif olunduğu ehtimal olunarsa, "aqillər metodu"nun ən mühüm prinsipi olan "dəlilsizlik" qanununa güvənərək həmin ayənin .ilkin zahiri (ibtidai) mənasına əsaslanmaq olar

Başqa sözlə, təhrif olunmuş kitabın etibarlı sayılması üçün məsumların (ə) təsdiq etməsinə ehtiyac yoxdur.

Bu metoddan yalnız “aqillər”in bu qanuna “birgə dəlil” mövcud olduğu güman olunduqda icazə verdikləri zaman yararlanmaq olar. Halbuki, araşdırmalara əsasən, “aqillər” bu qanundan yararlanmağa yalnız “birgə dəlil” olmadıqda, yəni danışanın sözündən ayrı hər hansı bir dəlil olmadıqda icazə verirlər. “Birgə dəlil”in olduğu ehtimal olunduqda isə bu metoddan istifadə etmək olmaz. Təhrif məsələsində də “icmali” şəkildə (ümumi bilik şəklində) bildikdən sonra ehtimal olunan, “birgə dəlil”in mövcudluğudur; hansı ki, təhrif nəticəsində aradan getmişdir.

## ON DÖRDÜNCÜ MƏQAM

### “SƏQƏLEYN” HƏDİSİ, QURANIN TƏHRİF OLUNMADIĞINA ƏN TUTARLI DƏLİLDİR

Quranın təhrif olunmadığına dəlil olan ən mühüm rəvayət “Səqəleyn” hədisidir. Hansı ki, Peyğəmbərin (s) Əli (ə), Əbuzər, İbn Abbas, Abdullah ibn Ömər, Hüzeyfə və Əbu Əyyub Ənsari kimi ٣٣ min nəfərə yaxın böyük səhabələri nəql etmiş və ٢٠٠-ə yaxın böyük “əhli-sünnə” alimi öz kitabında qeyd etmişdir. Sözügedən hədis, sənədlərindən birinə əsasən belədir:

Həzrət Peyğəmbər (s) buyurur:

إنّی تـارِکٌ فیکُمُ الثَّقَلَیْنْ، کِتـابَ اللهِ وَ عِتْرَتی وَ فیهِ الْهُـدی وَ النُّور، فَتَمَسَّکُوا بِکِتـابِ اللهِ وَ خُـذُوا بِهِ وَ أهْلَ بَیْتی، أذْکُرُکُمُ اللهَ فی أهْلِ بَیْتی (ثَلاثَ مَرّات)(١)

Təhrifin inkarı üçün bu hədisə iki yolla əsaslanmaq mümkündür:

Birinci yol: Bu, altı məqama diqqət yetirdikdə aydınlaşır.

١. Hədisdə göstərilir ki, Qiyamət gününə qədər Qurana tapınmaq mümkündür.



---

١- [٤٠] Sünəni-Darəmi, c. ٢, səh. ٤٣١.

.Quranın təhrif olunması ona tapınmağın mümkünlüyünü şübhə altına alır.۲

Qurana tapınmaq, onun bütün buyuruqlarına əməl etmək deməkdir. Burada məqsəd.۳ yalnız əhkamla bağlı məhdud ayələrə əməl etmək deyil. Başqa sözlə desək, Quranda məqsəd, yalnız əhkam və əməli (praktiki) göstərişlərin izahı deyil, əksinə, daha geniş .məna, insanlıarın hidayət olunması, zülmətdən nura doğru nicatıdır

Təhrifdə məqsəd, Quranın bəzi həqiqətlərini gizlətmək və nurunu qismən də olsa.۴ söndürməkdir. Təbii ki, təhrif olunmuş kitab bütün sahələrdə bir hidayət çırağı kimi bəşəriyyətin yoluna işıq saça bilməz. Bir halda ki, Quran öz məqsədinin insanları zülmətdən nura çıxarmaq, onları ən yüksək maddı və mənəvi məqamlara ucaltmaq .olduğunu bildirir və bu, yalnız ona əməl etməklə mümkündür

Qurana tapınmaq, itrətə tapınmaqdan fərqli olaraq, yalnız Quranın özünü əldə.۵ etdikdən sonra mümkündür. Bu, “Əhli-beyt”in yanında qorunub saxlanan və əlçatmaz .Quran deyil, insanların ixtiyarında olan Quran olmalıdır

Hədisdən aydın olur ki, Qurana tapınmaq nəinki mümkün, əksinə, vacibdir. Çünki.۶ burada xəbər cümləsi əmr cümləsi şəklində işlədilmişdir və bu “təklifi hökm”dür. “Üsul” elmindən aydın olduğu kimi, şəriət göstərişlərində əmr olunan hökm ona əməl edəcək insanların bacarığı xaricində olmamalıdır. Təbii ki, Quran təhrif olunsaydı, ona .tapınmaq mümkün olmayacaqdı

İkinci yol: Hədisdən məlum olur ki, iki ağır yükün hər biri ayrı-ayrılıqda, müstəqil və tam dəlildir. Birinin etibarlı hesab olunması, digərinin təsdiq etməsinə bağlı deyil. Əlbəttə, bu heç də onların hər birinin ayrı-ayrılıqda bəşəriyyəti son kamillik həddinə ucaltmaq və azğınlıqlardan, büdrəmələrdən qorumaq üçün kifayət olduqları demək deyil. Bütün bunlar bu iki ağır yükün üzərinə düşən müştərək vəzifələrdir. Deməli, Quran təhrif olunduğu təqdirdə ilkin zahiri (ibtidai) mənası etibardan düşür və nəticə etibarı ilə təhrif olunmuş kitaba əsaslanmaq üçün məsumların (ə) onu təsdiq etməsi zərurəti meydana çıxır və hədisin ilkin zahiri (ibtidai) mənası ilə ziddiyyət təşkil edir. Çünki hədisin ilkin zahiri (ibtidai) mənasından bu iki dəlilin müstəqil olduğu məlum olur. ?Ümumiyyətlə, böyük əmanətin etibarı kiçik əmanətə necə bağlı ola bilər

:Bu iki əsaslanmadan belə bir nəticə alırıq

.Birincisi, Qurana tapınmaq, ona əməl etmək nəinki mümkün, əksinə, vacibdir

İkincisi, Quran müstəqil dəlildır. Məlum olduğu kimi, təhrif nəzəriyyəsi hədisdən alınan .bu iki nəticə ilə ziddiyyət təşkil edir

## ON BEŞİNCİ MƏQAM

TİLAVƏTİN "NƏSX"İ VƏ "İNSA" ANLAYIŞLARI

Əhli-sünnə alimlərinin əsərlərində "tilavətin nəsxi" və "insa" terminlərinə tez-tez rast gəlirik. Onların bəzisi tilavətin "nəsx" olunmasının "icmali" şəkildə baş verdiyinə əqli (rasional) və nəqli (ənənəvi) dəlillər olduğu qənaətindədirlər.(١) Aşağıdakı sətirlərdə iki terminin təhrif anlayışı ilə nə kimi fərqi olduğunu və ya tilavətin "nəsx" olunmasını (qüvvədən düşməsini) qəbul etdikdə təhrifi qəbul etmiş olub-olmadığımızı araşdırmaq istəyirik. Hədis kitablarında bir çox hədislər mövcuddur ki, əhli-sünnə alimlərini, onları "tilavətin nəsxi"nə yozmağa vadar etmişdir. Bu rəvayətlərdən biri "rəcm" (daşqalaq) məsələsi ilə bağlıdır. Ibn Abbasın nəql etdiyinə görə, Ömər demişdir: "Peyğəmbərə (s) (الشَّيْخُ وَالشَّيْخَةُ إذَا زَنَيا فَارْجُمُوهُما...) .nazil olan ayələrdən biri də "rəcm" (daşqalaq) ayəsidir Peyğəmbər (s) öz dövründə bu hökmü həyata keçırırdı. Biz də o həzrətdən sonra bu (hökmü həmin şəkildə icra edirdik".(٢

Zeyd ibn Sabit deyir: "Peyğəmbərdən (s) eşitdim ki, ailəli kişi və ya ailəli qadın zina ."edərsə, daşqalaq olunmalıdır

Zeyd, Peyğəmbərin (s) bu sözünün Quranın bir hissəsi olduğunu iddia etməmişdir. Ömər isə bunun Quran ayəsi olduğunu güman etmiş, Peyğəmbərdən (s) onu Qurana (yazıb-yazmaması haqqında soruşduqda, həzrət (s) cavab verməmişdir.(٣

Əhli-sünnə alimləri bu hökmün və Peyğəmbərin (s) sözünün Quran ayəsi olduğunu düşünmüş və tilavətinin (oxunuşunun) "nəsx" olunduğunu (qüvvədən düşdüyünü), .hökmün özünün isə hələ də qüvvədə olduğunu iddia etmişlər

Bu nöqteyi-nəzər elmi dairələr tərəfindən kəskin tənqid atəşinə tutulmuş və ona bir :çox iradlar bildirilmişdir. Bu irad və tənqidlərə nəzər salaq

Nəsx"in, növündən asılı olmayaraq, (yəni istər oxunuşun, istərsə də hökmün nəsx.١ olunması) "nasix"ə (nəsx edən, qüvvədən salan yeni hökmə) ehtiyacı var. Məlum ayəni .qüvvədən salacaq hər hansı bir ayə mövcud deyil

Lazımi yerlərdə sübuta yetirilmişdir ki, "nəsx" şəriət hökmləri çərçivəsində olmalıdır..٢

Tilavət isə şəriət hökmü deyil (əlbəttə, bu irada belə bir cavab verilmişdir



---

.Əl-Əhkam fi-üsulil-əhkam, səh. ۱۵۴ [۴۱] -۱

.Müsnəde-Əhməd ibn Hənbəl, ۱/۴۷ [۴۲] -۲

.Mühəlla, İbn Həzm, c. ۱, səh. ۲۵۳ [۴۳] -۳

ki, tilavətdə məqsəd onun özü deyil, ayənin oxunmasının hökmüdür. Belə olan halda (onu bir şəriət hökmü hesab etmək olar).(١

Bu növ “nəsx”in, yəni ayənin oxunuşunun qüvvədən düşməsi, özündə əks etdirdiyi.٣ ?hökmün isə hələ də qüvvədə qalmasının nə faydası var

:Ən mühüm irad Ayətullah Xoyiyə məxsusdur. O yazır.۴

Əgər bu “nəsx” (yəni oxunuşun qüvvədən düşməsi) Peyğəmbərin (s) yaşadığı dövrdə,“ o həzrətin göstərişi ilə həyata keçirilibsə belə, təhrifə səbəb olmamasına baxmayaraq, bu məsələni özündə əks etdirən rəvayətlər “xəbəri-vahid”dir və təbii ki, onlara etimad göstərmək olmaz. Bundan başqa, həmin rəvayətlərin bəzisində bu növ “nəsx”in Peyğəmbər (s) zamanından sonra baş verdiyi göstərilir. Belə olan halda, əgər bu “nəsx” alimlər, dövrün biliciləri tərəfindən həyata keçirilmişdirsə, bu, təhrifi qəbul (etmək deməkdir”.(٢

Rəcm” (daşqalaq) məsələsi haqqında deyilənlərin yanlışlığı isə olduqca aydın“ məsələdir. Çünki Quranın davamlı olaraq yazılmasına böyük diqqət göstərən, vəhy katiblərinə hər bir ayənin qeydə alınmasını tapşıran Peyğəmbər (s), “rəcm” ayəsinin Qurandan olmasına baxmayaraq, onun yazılmasına diqqətsizlik göstərib Ömərin ?sualına cavab olaraq necə susdu

Deməli, oxunuşun qüvvədən düşməsi məsələsi yanlışlığı aydın olan məsələlərdəndir. Belə ki, bir çox müasir əhli-sünnə alimləri əqli baxımdan oxunuşun qüvvədən düşməsini qəbul etsələr də Quranda belə bir “nəsx” olmadığı fikrindədirlər.(٣) İbn Həzm Əndəlosi öncə oxunuşun qüvvədən düşməsini qəbul etsə də sonda onu, Qurana (aidiyyatı olmayan bir şəkildə izah etmişdir.(۴

**ON ALTINCI MƏQAM**

ŞİƏ MƏZHƏBİ TƏHRİF MÜDDƏASINI QƏBUL EDƏ BİLMƏZ

Şiə məzhəbi nəinki təhrif müddəasını qəbul etmir, prinsipcə onu qəbul edə də bilməz. Çünki Şiə məzhəbinin etiqadı ilə bağlı məsələlərin özülünü Quranın “Təthir” ayəsi təşkil .edir

səh:۲۸

---

۱- [۴۴] Əl-Əhkam, Amudi, ۳/۱۵۵.

۲- [۴۵] Əl-Bəyan, səh. ۲۰۶.

۳- [۴۶] Fəthül-mənnan fi nəsxil-Quran, səh. ۲۲۴.

۴- [۴۷] Mühəlla, İbn Həzm, c. ۱۰, səh. ۱۶.

وَيُطَهِّرَكُمْ تَطْهِيرًا ) إِنَّمَا يُرِيدُ اللَّهُ لِيُذْهِبَ عَنكُمُ الرِّجْسَ أَهْلَ الْبَيْتِ )

Allah siz əhli-beytdən çirkinliyi (günahı) yox etmək və sizi tərtəmiz (pak) etmək“ ”!istəyir

Lazımi yerlərdə sübuta yetirilmişdir ki, bu ayə Əhli-beytin (ə) məsumluğuna aşkar dəlildir. Hansı ki, bu məsumluq xəlifəlik və rəhbərliyin başlıca şərtidir. Quranın təhrif olunduğunu iddia edən kimsə, artıq məsumluğun isbatı üçün bu ayəyə əsaslana bilməz. Bu ayənin əsl məqsədi, o zaman məlum olar ki, “Həmd” surəsi ilə başlanan, Peyğəmbər (s) dönəmində tərtib edilən, sonradan heç bir dəyişikliyə məruz qalmayan, hər bir ayəsi özünəməxsus lazımi yerdə yerləşən, belə ki, yeri dəyişdikdə məqsədinin də aradan getdiyi Quranı qəbul edək. Bu ayədə Allahın məqsədi budur ki, Peyğəmbərin (s) qadınlarının üzərinə düşən vəzifələri açıqlamaqla yanaşı məsum Əhli-beyt (ə) haqqında da xüsusi məsələni aydınlaşdırsın və onlara özünəməxsus vəzifələri olduğunu xatırlatsın. Hər halda bu kimi ayələrin təhrif olunduğu ehtimal olunarsa, artıq (Şiə etiqadları üçün heç bir əsas, dəlil qalmayacaq.(١

**ON YEDDİNCİ MƏQAM**

TƏHRİFLƏ BAĞLI RƏVAYƏTLƏRƏ ÜMUMİ BAXIŞ

Təhrif müddəasını qəbul edənlərin ən mühüm dəlilləri Şiə və Əhli-sünnə kitablarında qeyd olunmuş rəvayətlərdir. Bu rəvayətlərin sayı bir çox tədqiqatçıların hesablamalarına görə, ١١٢٢-yə yaxındır. Bəziləri bunların “icmali” şəkildə “mütəvatir” olduğunu qəbul edirlər. Onların fikrincə, bu rəvayətlərin çoxunun sənəd baxımından (zəif olduğuna baxmayaraq, hədislərin çoxluğuna görə onların içində “səhih”(٢



---

Ətraflı məlumat üçün “Əhli-beyt” və ya “Parlaq simalar” kitabına müraciət [ ٤٨] -١ .olunsun

Hədis” elmi terminologiyasında məsumlara (ə) qədər olan sənəd silsiləsində“ [٤٩] -٢ özünə yer almış rəvayətçiləri bütünlüklə ١٢ imamlı və etibarlı olan hədisə “səhih” hədis .deyilir

hədislərin olduğu da ehtimal olunur. Təhrif müddəasını qəbul edənlər bu hədislərə .əsaslanaraq, Quran ayələrinin azaldıldığını iddia edirlər

.Böyük alimlər bu rəvayətlərə cavab olaraq iki baxımdan irad tutmuşlar

.Sənəd və bu rəvayətlərin yer aldığı kitablar baxımından.۱

.Mövcud hədislərin təhrif müddəasını təsdiq edib, yaxud etməməsi baxımından.۲

:İndi isə hər iki iradın izahına nəzər salaq

:Birinci iradın izahı

Bu hədislərin çoxunun sənədində Əhməd ibn Məhəmməd Səyyari olduğu müşahidə olunur. "Rical" alimlərinin fikrincə, o, dinə əhəmiyyət verməyən və zəif hədislər nəql edənlərdəndir. Nəcaşi onu "ğülüvv" etməkdə (Peyğəmbər (s) və imamlara (ə) pərəstişdə ifrata varıb, bəzi ilahi xüsusiyyətləri onlara aid etmək) etməkdə ittiham .edir

(İbn Qəzairi isə onu yolunu azmış adlandırır.(۱

Bu rəvayətlərin sənəd silsiləsində müşahidə olunan rəvayətçilərdən biri də Hüseyn ibn Zibyandır. "Rical" alimləri onun haqqında yazırlar: "O, (elm və iman baxımından) çox ."zəifdir, onun bütün kitablarında "xəlt" (qatqı) mövcuddur

İbn Qəzairi onu "ğülüvv" edən, hədsiz yalançı və saxta hədis quraşdıran adlandıraraq (məzəmmət edir.(۲

Rəvayətlərin sənəd silsiləsində müşahidə olunan üçüncü şəxs Əli ibn Əhməd Kufidir. Rical alimlərinin fikrincə, o, (elm və iman baxımından) zəif, rəvayətlərdə dəyişiklik aparan, bir çoxlarına görə isə yolunu azmış "ğali"lərdən (Peyğəmbər (s) və imamlara .(ə) pərəstişdə ifrata varıb, bəzi ilahi xüsusiyyətləri onlara aid edən) olmuşdur

Yuxarıda qeyd olunanlardan göründüyü kimi, bu hədisləri nəql edən rəvayətçilər (elm .və iman baxımından) olduqca zəif olduqları üçün onlara etibar etmək olmaz

Bundan başqa, bu rəvayətlərin qeyd olunduğu kitabların böyük əksəriyyəti olduqca :etibarsız kitablardır. Bu kitabları nəzərdən keçirək

Bu rəvayətlərin bəzisi Səd ibn Abdullah Əşəriyə aid edilən kitabdan götürülmüşdür..١ Bu kitabın Noman və Seyid Mürtəzaya aid olduğu qənaətində olanlar da vardır. Kitab .müəllifi dəqiq məlum olmadığından heç bir Rical alimi onu etibarlı hesab etməmişdir



---

.Qamusur-rical, c. ١, səh. ۴٠٣ [۵١] -١
.Xülasətür-rical, səh. ٢۶۶ [۵٢] -٢

Bu hədislərin bir neçəsi Süleym ibn Qeys Hilalinin kitabından götürülmüşdür. Hansı ki,.۲
:Şeyx Müfid bu kitab barəsində yazır

Bu kitaba heç bir şəkildə etibar etmək olmaz. Əksər hallarda ona uyğun şəkildə əməl“
etmək düzgün deyil. Sözügedən kitabda dəyişikliklər aparılmışdır. Dinə bağlı kimsələr
(bu kitabdan uzaq gəzməlidirlər”.(۱

Üçüncü kitab “Kitabüt-tənzil vət-təhrif” və yaxud “Qiraətlər” kitabıdır. Bu kitabın.۳
müəllifi Əhməd ibn Məhəmməd Səyyardır. Öncə qeyd etdiyimiz kimi “rical” alimləri
.onun (elm və iman baxımından) zəif olduğunu bildirmişlər

Bu rəvayətlərin bəzisi Əbil-Carudun bədii təfsirindən götürülmüşdür. Əbil-Carud.۴
İmam Sadiqin (ə) lənət oxuduğu şəxs olmuşdur. Bundan başqa, bu təfsirin sənədində
Kəsir ibn Əyyaş müşahidə olunur. Hansı ki, onun da (elm və iman baxımından) zəif
.olduğu bildirilmişdir

Belə kitablardan biri də Əli ibn İbrahim Qumiyə aid edilən təfsir əsəridir. Bu, onun öz.۵
şagirdi Əbülfəzl əl-Abbas ibn Məhəmməd Ələviyə dediklərinin yazılı formasıdır.
.Bundan başqa, Əbil-Carudun təfsiri ilə də qarışmışdır

Bu rəvayətlərin istinadgahlarından biri də Əli ibn Əhməd əl-Kufinin “İstiğasə”.۶
.kitabıdır. Hansı ki, İbn Qəzairi onun yalançı və ğali olduğunu bildirmişdir

Bu rəvayətlərin bəzisi Təbərsinin “Ehticac” əsərindən götürülmüşdür. Hansı ki, bu.۷
kitabda qeyd olunan hədislərin əksəryyəti “mürsəldir”.(۲) Ona görə də bu kitaba bir
.hədis kitabı kimi əsaslanmaq olmaz

Bu hədislərin əksəriyyəti “Üsuli-kafi” kitabında da qeyd edilmişdir. Lakin bu və ya.۸
digər hədisin yalnız hər hansı bir kitabda qeyd olunması, onun düzgün olduğuna dəlil
ola bilməz. Bir çoxlarının iddiasına görə “Üsuli-kafi”də mövcud olan ۱۶۱۹۹ hədisin yalnız
۵۱۷۲-si “səhih”dir. Təqribən, ۱۴۴ hədis “həsən”(۳), ۲۱۲۸ hədis “müvəssəq”(۴), ۳۰۲ hədis
(“qüvvətli”, ۷۴۸۰ hədis isə “zəif”(۵) hədislər sırasındadır.(۶

:İkinci iradın izahı

Sözügedən hədislər məzmunca fərqlidirlər və bu baxımdan onları aşağıdakı şəkildə :qruplaşdırmaq olar

Bu hədislərin bəzisi “mənəvi təhrif”lə bağlıdır. Hansı ki, bizim mübahisə.۱ .obyektimizdən xaricdir

Bu rəvayətlərin bəzisi qiraətdə mövcud olan fərqlərlə bağlıdır. Ona görə də mövzu.۲ .etibarilə təhrif məsələsinə heç bir aidiyyatı yoxdur



---

.Təshihül-etiqad, səh. ۷۲ [۵۳] -۱

Hədis” elmi terminologiyasında “mürsəl” sənəd silsiləsinin sonunda və ya“ [۵۴] -۲ .hamısında rəvayətçilərin məlum olmadığı hədisə deyilir

Hədis” elmi terminologiyasında “həsən” o tipli hədislərə deyilir ki, sənəd“ [۵۵] -۳ silsiləsində mövcud olan rəvayətçılərin hamısı və ya bəzisi mədh edilmiş, lakin ədalətlı .olduqları açıq şəkildə bildirilməmişdir

Hədis” elmi terminologiyasında “müvəssəq” o tipli hədislərə deyilir ki, sənəd“ [۵۶] -۴ silsiləsində mövcud olan rəvayətçılərin etibarlı olmasına baxmayaraq, bəziləri ۱۲ .imamlı deyil

Hədis” elmi terminologiyasında “səhih”, “həsən” və “müvəssəq” olmayan hədisə“ [۵۷] -۵ .“zəif” hədis deyilir

.Derasatun fil-hədis vəl-muhəddisin, səh. ۱۳۷ [۵۸] -۶

Belə hədislərin bir qismi isə bir ayənin izahı və ya təfsiridir. Lakin bir çoxları ayənin.۳ .izahını təfsir deyil, məhz ayənin bir hissəsi olduğunu güman etmişlər

:Buna misal olaraq aşağıdakı hədisi göstərmək olar

رَوى الكُلينى بأسنادِهِ عَنْ موسى بن جعفر – عليه السلام – فى قوله تعالى: ( الَّذِينَ يَعْلَمُ اللّهُ مَا فِى قُلُوبِهِمْ فَأَعْرِضْ عَنْهُمْ وَعِظْهُمْ وَقُل لَّهُمْ فِى أَنفُسِهِمْ قَوْلاً بَلِيغًا )

إنه – عليه السلام – تلا هـذه الآيه الى قوله: ( فَأَعْرِضْ عَنْهُمْ ) و اضاف ;فَقَدْ سَبَقَتْ عَلَيْهِمْ كَلِمَهُ الشَّفاءِ وَ سَبَقَ لَهُمْ الْعَذاب; وَ تَلا بَقيه الآيه (١)

:Mühəddis Nuri yazır

Hədisdə mövcud olan ümumi vəziyyət bu əlavənintəfsir deyil, məhz Quranın bir“ (hissəsi olduğunu göstərir”.(٢

.Əllamə Məclisi və s. alimlər bu əlavənin təfsir (açıqlama, izah) olduğu qənaətindədirlər

Bəzi ayələrdə həzrət Əlinin (ə) və digər məsumların (ə) adlarının olduğunu iddia edən.۴ hədislər. Bu məzmunda olan hədislər də yalnız təfsir əhəmiyyəti daşıyır və əsla .məsumların (ə) adının Quranın tərkib hissəsi olduğunu bildirmir

Bəzi hədislər də Qüreyş qəbiləsindən olan bir neçə nəfərin adının Quranda olduğunu.۵ göstərir. Guya Quran təhrif olunaraq həmin adlar çıxarılmış, yalnız Əbu Ləhəbin adı .saxlanılmışdır

:Bu qrupa daxil olan hədislərdə iki irad özünü açıqca göstərməkdədir

Birinci irad: Bu hədislər biri digərini inkar edəcək dərəcədə ziddiyyətlidir. Çünki çıxarıldığı iddia edilən adların sayı bəzi hədislərdə ۷۰, bəzilərində isə ۷ şəklində .göstərilmişdir

İkinci irad: Bu hədislərin məzmununa diqqət yetirdikdə yalan olduğu üzə çıxır. ?Ümumiyyətlə, bu adlardan nə üçün yalnız Əbu Ləhəbin adı qalmalı idi

Peyğəmbərin (s) vəfatından sonra Quranda bəzi sözlərin dəyişdirilməsini, başqa.۶

sözlə, Quranın həm azaldılma yolu ilə həm də əlavələr olunması yolu ilə təhrif .olunduğunu göstərən hədislər

Bu qrupa daxil olan hədislər də müsəlmanların yekdil rəyi ilə ziddiyyət təşkil edir. Çünki .müsəlmanlar bütünlüklə Qurana bir hərf belə artırılmadığı qənaətindədirlər



---

.Rəvzətu Kafi, ۸/۱۸۴ [۵۹] -۱

.Fəslül-xitab, səh. ۲۷۵ [۶۰] -۲

Həzrət İmam Zamanla (ə) bağlı hədislər. Bu hədislərə görə, O, zühur etdikdən sonra.۷ camaatı həzrət Əlinin (ə) özündə saxladığı “müshəfi” (Quranı) oxumağa məcbur .edəcək

Bu məzmunda olan hədislərin təhriflə heç bir əlaqəsi yoxdur. Çünki həzrət Əlinin (ə) tərtib etdiyi “müshəf”in hazırkı Quranla fərqliliyi danılmazdır, lakin bu fərqlər Quranın mətni ilə bağlı deyil, əksinə, onun tərtib olunmasında bəzi əlavə izah və açıqlamalarla .bağlıdır

Qurandan hər hansı bir sözün və ya ayənin çıxarıldığını göstərən hədislər. Bu.۸ :hədisləri aşağıdakı şəkildə qruplaşdırmaq olar

.Quran ayələrinin həqiqi sayının hazırkından daha çox olduğunu göstərən hədislər.۱

Quranda mövcud olan bəzi surə və ayələrinin sayının əslində olduğundan az.۲ .olduğunu göstərən hədislər

.Bir sözün və ya ayənin azaldıldığını göstərən hədislər.۳

:Bunlara cavab olaraq deməliyik ki

Birincisi, bu hədislər Quranla ziddiyyət təşkil edir. Ona görə də onlara əsaslanmaq .olmaz

İkincisi, belə hədislər arasında biri digərini inkar edəcək dərəcədə ziddiyyətli hədislər .mövcuddur

Üçüncüsü, əgər bu hədislərin içində “səhih” hədis olsa belə, ona əsaslanmaq olmaz. Çünki bunlar “xəbəri-vahid” qisminə daxildirlər və belə mühüm məsələdə “xəbəri-.vahid”ə əsaslanmaq məqsədəuyğun deyil

Dördüncüsü, bu hədislərin bəzisi məsumların (ə) adının Qurandan çıxarılmasından xəbər verir. Öncə qeyd etdiyimiz kimi, bu məzmunda olan hədislər yalnız təvil, təfsir və .ya nümunələrin izahıdır

## Haqqında mərkəzi

Allahın adı ilə

Rəhman və Rəhimli olan Allahın adı ilə.Və bütün həmdlər aləmlərin rəbbi olan Allaha .məxsusdur

.Varlıq aləminin Kövsəri olan Həzrəti Fatiməyi Zəhraya (a) təqdim olunur

(Bilən kimsələrlə (alimlər) bilməyənlər (cahillər) eynidirlərmi? (Zümər sürəsi, ayə ۹

:Ön söz

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi ۲۰۰۶-cı ildən Mərhum Ayətullah Seyyid Həsən Fəqih İmaminin nəzarəti altında,elmi mərkəzlərdə tanınan görkəmli tələbələrin vasitəsi ilə məzhəb,mədəniyyət və elmi sahələrdə öz fəaliyyətinə .başlamışdır

:Məramnamə

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi təhqiqatçıların dini biliklərə rahət və tez bir zamanda yiyələnmələri üçün hər bir xidməti onların ixtiyarında qərar vermişdir.Və bu sahədə təəssübkeşlikdən,ictimai,siyasi,fərdi cəryanlardan uzaq duraraq yalnız və yalnız elmi sahədə ixlasla öz xidmətini həyata keçirməkdədir.Bu səbəbdən adı çəkilən müəssisə layihəsini həyata keçirmiş.Və tədqiqat üçün nəzərdə tutulmuş kitabları,məqalələri mütəxəssislər və müxtəlif təbəqələrdən olan insanlar üçün,bir neçə dillərdə və formalarda hazırlayaraq,heç bir məbləğ tələb etmədən sosial .medyada istifadəçilərin ixtiyarında qoymuşdur

:Hədəflər

Quran və Əhli beyt mədəniyyətini və maarifini yaymaq.۱

İnsanları,xüsusən gəncləri tam dəqiq şəkildə dini məsələləri araşdırmağa.۲ sövqləndirmək

Telefon,tablet və kompüterlərdə olan faydasız,yararsız mövzuların yerini .۳ faydalı,mənəviyyatlı mövzularla doldurmaq

.Təhqiqatla məşğul olan tələbələrə xidmət etmək.۴

.Kitab və elmi əsərlər oxumaq mədəniyyətini yaymaq.۵

.Müəlliflərin öz elmi əsərlərini digital formada yaymaq üçün onlara şərait yaratmaq.۶

:İcraçılıq

.Qanunla icazəli olan lisenziyaya malik əsərlərin yayımı.۱

.Bu mərkəz kimi xidmət göstərən oxşar mərkəzlərlə əlaqə.۲

.(Paralel xidmətlərdən çəkinmək (başqalarının etdiklərini təkrarlamamaq.۳

.Yalnız və yalnız elmi məsələləri yaymaq.۴

.Nəşriyyatın mənbələrini qeyd etmək.۵

.Qeyd:Kitabda olanlara görə məsüliyyət o kitabı yazan müəllifin öhdəsindədir

:Müəssisənin fəaliyyəti

.Kitabların çapı və nəşri.۱

.Kitab oxumaq müsabiqələrinin təşkili.۲

.Məcazi sərgilərin istehsalı.۳

.Kompüter oyunlarının istehsalı.۴

Qaimiyyə internet saytının yaradılması:www.ghaemiyeh.com.۵

.Sərgi məhsullarının və moizələrin istehsalı.۶

.Şər'i,əxlaqi və etiqadi suallara cavab.۷

.Mühasibat,mətbuat yaratmaq və sms... sistemlərinin layihəsi.۸

.Təlim kurslarının həyata keçirilməsi.۹

Tərbiyəçi şəxslər hazırlamaq üçün təlim kurslarının təşkili.۱۰

Kompüterdə,tabletdə və telefonlarda icrası mümkün olan minlərlə proqramların.۱۱ dünyada məşhur olan səkkiz formada istehsalı

JAVA.۱

ANDROID.۲

EPUB.۳

CHM.۴

PDF.۵

HTML.۶

CHM.۷

GHB.۸

.v.Qaimiyyə kitab bazarı adına dörd market

ANDROID.۱

IOS.۲

WINDOWS PHONE.۳

WINDOWS.۴

deyilənlər müəssisənin veb saytında Fars,Ərəb,İngilis və Azərbaycan dillərində pulsuz

.istifadəyə verilmişdir

:Sonunda

Mərcəi təqlid müctəhidlərin dəftərxanalarından (ofis),müəssisələrdən,nəşriyyatçılardan,müəlliflərdən və əməyi olan bütün şəxsiyyətlərdən bizlərə hədəfə çatmaqdan ötrü yardım etdikləri üçün səmimi qəlbdən .təşəkkür edirik

:Mərkəzin ünvanı

İsfahan-Əbdurrəzzaq küçəsi-Hacı Muhəmməd Cəfər adına bazar-Şəhid Muhəmməd Həsən Təvəkküli küçəsi-blok۱۲۹/۳۴-birinci mərtəbə

veb sayt:www.ghbook.ir

mail:Info@ghbook.ir

mərkəzin ofis telefonu: ۰۰۹۸۳۱۳۴۴۹۰۱۲۵

Tehran ofisi: ۰۰۹۸۲۱۸۸۳۱۸۷۲۲

Biznes və alqı satqı: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

Mərkəzdə çalışan insanlarla əlaqə yaratmaq üçün nəzərdə tutulan nömrə: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

